بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

## *TƏRCÜMƏÇİDƏN*

Həqiqətən şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyirik, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə o, doğru yolda olar, kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱتَّقُواْ ٱللَّهَ حَقَّ تُقَاتِهِۦ وَلَا تَمُوتُنَّ إِلَّا وَأَنتُم مُّسۡلِمُونَ

**"Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!"[1]**

يَٰٓأَيُّهَا ٱلنَّاسُ ٱتَّقُواْ رَبَّكُمُ ٱلَّذِي خَلَقَكُم مِّن نَّفۡسٖ وَٰحِدَةٖ وَخَلَقَ مِنۡهَا زَوۡجَهَا وَبَثَّ مِنۡهُمَا رِجَالٗا كَثِيرٗا وَنِسَآءٗۚ وَٱتَّقُواْ ٱللَّهَ ٱلَّذِي تَسَآءَلُونَ بِهِۦ وَٱلۡأَرۡحَامَۚ إِنَّ ٱللَّهَ كَانَ عَلَيۡكُمۡ رَقِيبٗا

[1] "Ali-İmran", surəsi, 102.

**“Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın *törədib yer üzünə* yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir”.[1]**

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱتَّقُواْ ٱللَّهَ وَقُولُواْ قَوۡلٗا سَدِيدٗا ﴿٧٠﴾ يُصۡلِحۡ لَكُمۡ أَعۡمَٰلَكُمۡ وَيَغۡفِرۡ
لَكُمۡ ذُنُوبَكُمۡۗ وَمَن يُطِعِ ٱللَّهَ وَرَسُولَهُۥ فَقَدۡ فَازَ فَوۡزًا عَظِيمًا ﴿٧١﴾

**“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar”.[2]**

05/05/2005

[1] “ən-Nisa”, surəsi, 1.
[2] “əl-Əhzab”, surəsi, 70-71.

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

***Mərhəmətli və Rəhmli Allahın adı ilə!***

## *MÜƏLLİFİN MÜQƏDDİMƏSİ*

Şeyx İmam Hafiz Şəmsəddin Muhəmməd ibn Əhməd ibn Əffan əz-Zəhəbi ﷺ demişdir:

Allaha, onun kitablarına, rəsullarına, mələklərinə və qədərlərinə iman gətirdiyimizə görə Ona həmd edir, Peyğəmbərimiz Muhəmmədə, onun ailəsinə və səhabələrinə, bizi axirətdə ona yaxın edəcək salavat deyirik.

Bu bizə böyük günahları həm icmali, həm də təfsilatıyla anladan faydalı bir kitabdır. Allah bizə onlardan uzaqlaşmaqda yardımçı olsun. Uca Allah buyurur:

إِن تَجۡتَنِبُواْ كَبَآئِرَ مَا تُنۡهَوۡنَ عَنۡهُ نُكَفِّرۡ عَنكُمۡ سَيِّـَٔاتِكُمۡ وَنُدۡخِلۡكُم مُّدۡخَلٗا كَرِيمٗا

**“Sizə qadağan olunmuş böyük günahlardan çəkinsəniz, Biz sizin təqsirlərinizdən keçər və sizi şərəfli bir keçidə – *Cənnətə* daxil edərik”.** [ən-Nisa surəsi, 31-ci ayə.]

Bu ayədə Allah təala böyük günahlardan çəkinənləri Cənnətə daxil etməsinə zəmanət verir. Allah təala başqa bir ayədə buyurur:

ٱلَّذِينَ يَجۡتَنِبُونَ كَبَٰٓئِرَ ٱلۡإِثۡمِ وَٱلۡفَوَٰحِشَ إِلَّا ٱللَّمَمَۚ إِنَّ رَبَّكَ وَٰسِعُ ٱلۡمَغۡفِرَةِۚ

**“Onlar kiçik günahlar istisna olmaqla, böyük günahlardan və iyrənc əməllərdən çəkinirlər. Həqiqətən, sənin Rəbbin geniş məğfirət sahibidir...”** [ən-Nəcm surəsi, 32-ci ayə]

Peyğəmbər ﷺ demişdir: “Böyük günahlar istisna olmaqla bir namazdan digər namaza, cümədən növbəti cüməyə və ramazandan növbəti ramazana qədər edilən kiçik günahlar bağışlanılır”. Bu hədisi oxuduqdan sonra bizə hansı günahların böyük günahlar olduğunu arayıb araşdırmaq qalır. Bəzi alimlər aşağıdakı hədisə əsaslanaraq onların sayının yeddi olduğunu demişlər.[1]

Peyğəmbər ﷺ demişdir: “(sahibini) həlak edən yeddi günahdan çəkinin...”, və onların şirk, sehr etmək, cana qəsd etmək (onu öldürmək), yetimin malını haqsız olaraq yemək, Riba (faiz) yemək, döyüş meydanından qaçmaq və günahsız mömin qadınları zinakarlıqda ittiham etmək – olduğunu bildirmişdir.[2]

İbn Abbas رضي الله عنه isə böyük günahların sayının yeddi yox, yetmişə qədər olduğunu daha məqsədəuyğun saymışdır. Əslində elə İbn Abbasın رضي الله عنه rəyi daha doğrudur.

---

[1] (Səhih) Muslim /233/ Hədis Əbu Hureyrədən رضي الله عنه rəvayət olunub.

[2] (Səhih) əl-Buxari /2766/, Muslim /89/ Hədis Əbu Hureyrədən رضي الله عنه rəvayət olunub.

Çünki hədisdə böyük günahların sayının yalnız yeddi olduğu bildirilməmişdir. Buna da əsas dəlil adam öldürmək, zina etmək və oğurluq etmək kimi günahları edənin bu dünyada cəzalandırılması, axirətdə Allahın qəzəbinə və əzabına düçar olması və Muhəmmədin ﷺ dili ilə onların lənətlənməsidir. Bütün bunlar bizə bu kimi günahları böyük günahlardan saymağa əsas verir. Lakin onu da unutmamaq lazımdır ki, bu böyük günahların bəziləri digərlərindən daha böyükdür. Məgər görmürsənmi ki, Peyğəmbər ﷺ şirki böyük günahlardan saymışdır? Bunu edən isə əbədi cəhənnəmdə olacaq və o heç vaxt bağışlanmayacaqdır. Allah təala buyurur:

إِنَّ ٱللَّهَ لَا يَغۡفِرُ أَن يُشۡرَكَ بِهِۦ وَيَغۡفِرُ مَا دُونَ ذَٰلِكَ لِمَن يَشَآءُۚ

**“Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa *daha kiçik günahları* isə istədiyi kimsəyə bağışlayar...”. [ən-Nisa surəsi, 48 və 116-cı ayələr]**

Başqa bir ayədə isə buyurur:

إِنَّهُۥ مَن يُشۡرِكۡ بِٱللَّهِ فَقَدۡ حَرَّمَ ٱللَّهُ عَلَيۡهِ ٱلۡجَنَّةَ

**“Həqiqətən də, Allaha şərik qoşan kimsəyə, Allah Cənnəti haram etmiş...”** [əl-Maidə surəsi, 72-ci ayə]. Bu ayələri bir yerə cəm etsək belə bir nəticəyə gəlmiş oluruq.[1]

[1] (Səhih) Abdur-Razzaqın “Musannaf” əsəri /19702/, və Beyhəqinin “Şuəb” əsəri /294/.

Peyğəmbər ﷺ demişdir: "Sizə ən böyük günahların hansı olduğunu xəbər verimmi?" Dedilər: Bəli ey Allahın rəsulu. Dedi: "Allaha şərik qoşmaq, valideynə asi olmaq". Bunları dediyi zaman Peyğəmbər ﷺ söykənmiş vəziyyətdə idi, sonra isə o oturub dedi: "Bir də yalan yerə şahidlik etmək." O bu sözü o qədər çox təkrar etdi ki, biz özü-özümüzdə: kaş ki, o susaydı – dedik.[1]

Bu hədisdə Peyğəmbər ﷺ yalan yerə şahidlik etməyin böyük günahlardan olduğunu bildirməkdədir. Az öncə qeyd olunan hədisdəki yeddi günahın arasında isə bu yoxdur.

[1] (Səhih) əl-Buxari /2654/, Muslim /87/ Hədis Əbu Bəkradan رضي الله عنه –dan rəvayət olunmuşdur.



# Birinci böyük günah.
# Allaha şərik qoşmaq.

Şirk Allah təalanın səni yaratmasına baxmayaraq, Ona ibadətin hər hansı bir növündə başqasını, daşı, insanı, günəşi, ayı, Peyğəmbəri, şeyxi, cinlərlə əlaqəsi olan şəxsi, ulduzu, hökmdarı və başqa şeyləri şərik qoşmaq deməkdir.

Allah təala buyurur:

إِنَّ ٱللَّهَ لَا يَغْفِرُ أَن يُشْرَكَ بِهِۦ وَيَغْفِرُ مَا دُونَ ذَٰلِكَ لِمَن يَشَآءُ ۚ

**“Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa *daha kiçik günahları* isə istədiyi kimsəyə bağışlayar...”.** [ən-Nisa surəsi, 48-116-cı ayələr]

Başqa bir ayədə buyurur:

إِنَّهُۥ مَن يُشْرِكْ بِٱللَّهِ فَقَدْ حَرَّمَ ٱللَّهُ عَلَيْهِ ٱلْجَنَّةَ وَمَأْوَىٰهُ ٱلنَّارُ ۖ

**“Həqiqətən də, Allaha şərik qoşan kimsəyə, Allah Cənnəti haram etmiş və onun sığınacağı yer Oddur...”** [əl-Maidə surəsi, 72-ci ayə]

Həmçinin buyurur:

إِنَّ ٱلشِّرْكَ لَظُلْمٌ عَظِيمٌ

**“Həqiqətən, Allaha şərik qoşmaq böyük zülmdür!”** [Loğman surəsi, 13-cü ayə].



Bu barədə bir çox ayələr vardır. Allaha şərik qoşub, sonra bu halda ölən şəxs kəsinliklə Cəhənnəm əhlindəndir. Necə ki, Allaha iman gətirib, mömin olaraq ölən şəxs əzab olunsa belə Cənnət əhlindən olacaqdır.

Peyğəmbər ﷺ demişdir: "Sizə ən böyük günahın hansı olduğunu xəbər verimmi?.. Allaha şərik qoşmaq..."[1]

Həmçinin demişdir: "(Sahibini) həlak edən yeddi əməldən çəkinin." Onlardan da birinin şirk olduğunu qeyd etmişdir.[2]

Həmçinin ﷺ demişdir: "Dinini dəyişdirən kəsi öldürün".[3]

---

1 (Səhih) əl-Buxari /2654/, Muslim /87/. Hədis Əbu Bəkradan رضي الله عنه – dan rəvayət olunmuşdur.

2 (Səhih) əl-Buxari /2654/, Muslim /87/ Hədis Əbu Bəkradan رضي الله عنه – dan rəvayət olunmuşdur.

3 (Səhih) əl-Buxari /6922/. Hədis Abdullah ibn Abbasdan رضي الله عنه rəvayət edilmişdir.



# İkinci böyük günah.
# Adam öldürmək.

Uca Allah buyurur:

وَمَن يَقۡتُلۡ مُؤۡمِنٗا مُّتَعَمِّدٗا فَجَزَآؤُهُۥ جَهَنَّمُ خَٰلِدٗا فِيهَا وَغَضِبَ
ٱللَّهُ عَلَيۡهِ وَلَعَنَهُۥ وَأَعَدَّ لَهُۥ عَذَابًا عَظِيمٗا

**“Hər kəs qəsdən bir mömini öldürərsə, onun cəzası içərisində əbədi qalacağı Cəhənnəm *olar.* Allah ona qəzəblənər, onu lənətləyər və onun üçün böyük bir əzab hazırlayar.”** [ən-Nisa surəsi, 93-cü ayə]

Başqa bir ayədə buyurur:

وَٱلَّذِينَ لَا يَدۡعُونَ مَعَ ٱللَّهِ إِلَٰهًا ءَاخَرَ وَلَا يَقۡتُلُونَ ٱلنَّفۡسَ ٱلَّتِي حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلۡحَقِّ وَلَا
يَزۡنُونَۚ وَمَن يَفۡعَلۡ ذَٰلِكَ يَلۡقَ أَثَامٗا ٦٨ يُضَٰعَفۡ لَهُ ٱلۡعَذَابُ يَوۡمَ ٱلۡقِيَٰمَةِ وَيَخۡلُدۡ فِيهِۦ
مُهَانًا ٦٩ إِلَّا مَن تَابَ وَءَامَنَ وَعَمِلَ عَمَلٗا صَٰلِحٗا

**“Onlar Allahla yanaşı başqa məbuda yalvarmaz, Allahın haram etdiyi cana haqsız yerə qıymaz və zina etməzlər. Bunu edən kimsə cəzalandırılar. Qiyamət günü onun əzabı qat-qat artırılar və onun içində zəlil olub əbədi qalar. Ancaq tövbə edib iman gətirən və saleh əməllər edənlərdən başqa...”** [əl-Furqan surəsi, 68-70-ci ayələr]

Həmçinin buyurur:



**“diri-diri *torpağa* basdırılmış qız *uşağı* soruşulacağı zaman – hansı günaha görə öldürülmüşdür...”** [ət-Təkvir surəsi, 8-9-cu ayələr]

Peyğəmbər ﷺ demişdir: “(Sahibini) həlak edən yeddi əməldən çəkinin”. Onlardan birinin də Allahın haram buyurduğu cana qəsd edib onu öldürmək olduğunu qeyd etmişdir.[1]

Peyğəmbərdən ﷺ: “Ən böyük günah hansıdır?”– deyə soruşulduqda, o: “Allahın səni yaratmasına baxmayaraq, Ona şərik qoşmağın”– dedi. “Sonra hansıdır?”– deyə soruşulduqda dedi ki: “Sənin yeməyini yeyəcəyindən qorxub (paxıllıq üzündən) övladını öldürməyin”. “Sonra hansıdır?”– deyə soruşulduqda o: “Qonşunun xanımı ilə zina etməyin”– deyə buyurdu.[2]

Peyğəmbər ﷺ demişdir: “İki müsəlman (bir-birini öldürmək üçün) qılınclarıyla qarşılaşarlarsa öldürən də, ölən də Cəhənnəmlikdir”. Dedilər ki, Ey Allahın rəsulu öldürəni anladıq, bəs ölənin günahı nədir? Dedi ki: “Çünki o da dostunu öldürməyə həris idi”.[3]

---

[1] (Səhih) əl-Buxari /2766/, Muslim /89/ Hədis Əbu Hureyrədən رضي الله عنه rəvayət olunub.

[2] (Səhih) əl-Buxari /4477/, Muslim /86/. Hədis Abdullah ibn Məsuddan rəvayət edilmişdir.

[3] (Səhih) əl-Buxari /31/, Muslim /2888/ Hədis Nəfi ibn Hərisdən rəvayət olunmuşdur.



Peyğəmbər ﷺ demişdir: “İnsan haram qan tökməkdən çəkindiyi müddətdə, dinində firavanlıq içində olar”.[1]

Peyğəmbər ﷺ demişdir: “Məndən sonra biri-birinizin boynunu vurmaqla kafir olaraq dönməyin”.[2]

Peyğəmbər ﷺ demişdir: “İnsan haram qan tökmədiyi müddətdə, dinində firavanlıq içində olar”. Buxarinin ləfzi.[3]

Peyğəmbərﷺ demişdir: “İnsanlar arasında hər şeydən öncə axıdılan qanlara görə mühakimə olunacaq”.[4]

İbn Bureydə atasından Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Mömin bir kəsin qətlə yetirilməsi Allah yanında dünyanın məhvindən daha böyükdür”.[5]

Abdullah ibn Amr رضي الله عنه rəvayət edir ki, Allahın rəsulu ﷺ demişdir: “Ən böyük günahlar: Allaha şərik qoşmaq, insan qətlə yetirmək və valideynə qarşı itaətsizlikdir”.[6]

Uqbə ibn Məlik Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Allah, Ondan bir mömini qətlə yetirən şəxsin bağışlanmasını dilədiyim zaman mənə cavab vermədi”. – və o, bu sözləri üç dəfə təkrar etdi.[7]

---

[1] (Səhih) əl-Buxari /6862/, Abdullah ibn Ömərin rəvayəti.
[2] (Səhih) əl-Buxari /121/, Muslim /66/ Cabir ibn Abdullahın rəvayəti.
[3] (Səhih) əl-Buxari /6862.
[4] (Səhih) əl-Buxari /6533/, Muslim /1678/ Abdullah ibn Məsudun rəvayəti.
[5] (Həsən) ən-Nəsai 7/83.
[6] (Səhih) əl-Buxari /6675/.
[7] (Səhih) ən-Nəsai /8592/, Əhməd 4/10 və 5/289.



Peyğəmbər ﷺ demişdir: "Haqsızlıq edilərək öldürülən hər bir kəsin qanından ilk əvvəl Adəm oğlunun payına da günah yazılar. Çünki ilk qətli törədən o olmuşdur".[1]

İbn Ömər ﵁ Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Kim (müsəlmanlarla) sülh əhdi bağlamış bir kəsi qətlə yetirərsə, Cənnətin qoxusunu belə duymaz. Halbuki onun qoxusu qırx illik məsafədən duyulur".[2]

Əbu Hureyrə ﵁ Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Kim üzərində Allahın və rəsulunun əhdi və hifzi olan, sülh əhdi bağlanmış bir kəsi qətlə yetirərsə, Allahın əhdinə saymamazlıq etmiş olar. Buna görə də o Cənnətin qoxusunu belə duymaz. Halbuki onun qoxusu qırx illik məsafədən duyulur".[3]

Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mömin bir kəsin qətlə yetirilməsinə yarımçıq bir sözlə belə səbəb olan şəxs, Allahla görüşdükdə alnının ortasında: "Allahın rəhmətindən ümüdünü üzmüş" sözləri yazılmış halda görüşər".[4]

Müaviyə ﵁ demişdir: Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Kafir olaraq ölən və qəsdən bir mömini qətlə yetirən kəsdən başqa Allah hamının günahlarını bağışlaya bilər".[5]

---

[1] (Səhih) əl-Buxari /3335/, Muslim /1677/. İbn Məsudun ﵁ rəvayəti.

[2] (Səhih) əl-Buxari /3166/, ən-Nəsai 8/35. Abdulla ibn Amrın ﵁ rəvayəti.

[3] (Həsən) ət-Tirmizi /1403/, ibn Məcə /2687/.

[4] (Zəif) ibn Məcə /2620/, əl-Beyhəqi 8/22.

[5] (Səhih) ən-Nəsai 7/81, Əhməd 4/99, əl-Hakim 4/351.



# Üçüncü böyük günah.
# Sehrbazlıq.

Sehrbazlıqla məşğul olanın küfr etmiş olması labüddür. Uca Allah buyurur:

وَلَٰكِنَّ ٱلشَّيَٰطِينَ كَفَرُواْ يُعَلِّمُونَ ٱلنَّاسَ ٱلسِّحۡرَ وَمَآ أُنزِلَ عَلَى ٱلۡمَلَكَيۡنِ بِبَابِلَ هَٰرُوتَ وَمَٰرُوتَۚ

**“Lakin şeytanlar sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanı insanlara öyrədərək kafir oldular.”** [əl-Bəqərə surəsi, 102-ci ayə].

Şeytanın insana sehri öyrətməkdə yeganə məqsədi onun Allaha şərik qoşmasıdır.

Uca Allah Harut və Marut mələkləri haqqında buyurur:

وَمَا يُعَلِّمَانِ مِنۡ أَحَدٍ حَتَّىٰ يَقُولَآ إِنَّمَا نَحۡنُ فِتۡنَةٞ فَلَا تَكۡفُرۡۖ فَيَتَعَلَّمُونَ مِنۡهُمَا مَا يُفَرِّقُونَ بِهِۦ بَيۡنَ ٱلۡمَرۡءِ وَزَوۡجِهِۦۚ وَمَا هُم بِضَآرِّينَ بِهِۦ مِنۡ أَحَدٍ إِلَّا بِإِذۡنِ ٱللَّهِۚ وَيَتَعَلَّمُونَ مَا يَضُرُّهُمۡ وَلَا يَنفَعُهُمۡۚ وَلَقَدۡ عَلِمُواْ لَمَنِ ٱشۡتَرَىٰهُ مَا لَهُۥ فِي ٱلۡأٓخِرَةِ مِنۡ خَلَٰقٖۚ

**“*Mələklər*: “Biz ancaq bir sınağıq, sən gəl kafir olma!”– deməmiş *onu* heç kəsə öyrətmirdilər. *Yəhudilər* ərlə arvadı bir-birindən ayıracaq işləri onlardan öyrənirdilər. Lakin onlar Allahın izni olmadan heç kəsə zərər**



**verə bilməzlər. Onlar özlərinə zərər verən, faydası olmayan şeyləri öyrənirdilər. Onlar bilirdilər ki, onu əldə edən kimsə üçün axirətdə heç bir pay yoxdur...".** [əl-Bəqərə surəsi, 102-ci ayə].

Hal-hazırda bir çoxları sehrin küfr deyil, yalnız haram olduğunu zənn edərək, açıq-aydın sehr olan semiyanı* öyrənir, əksəriyyəti şirk və zəlalətdən ibarət olan məchul ifadələrlə kişini qadınla birləşdirmək, qadını ərinə sevdirmək və ya onlar arasında qarşılıqlı nifrət yaratmaq və başqa bu kimi əməllər edirlər. Sehrbaz Allaha qarşı küfr və ya ona bənzər əməl etdiyinə görə ölümlə cəzalandırılır.

Peyğəmbər ﷺ demişdir: "(Sahibini) həlak edən yeddi əməldən çəkinin". Onlardan birinin də sehr olduğunu qeyd etmişdir. Ona görə də insan Allahdan qorxub, onu həm bu dünyada, həm də axirətdə xəsarət çəkənlərdən edəcək əməllərə yaxın durmamalıdır.[1]

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: "Sehrbazın cəzası qılıncla boynunun vurulmasıdır". Əslində bu Cundubun رضي الله عنه sözüdür.[2]

Bicalə ibn Əbdə رضي الله عنه demişdir: "Ömərin ölümündən bir il öncə bizə ondan bir məktub gəldi ki, bütün sehrbaz kişi və qadınları öldürün".[3]

* Semiya – gerçəkdə olmayan xəyalları gerçəkləşdirməklə olan sehr növüdür.

[1] (Səhih) əl-Buxari /2766/, Muslim /89/ Hədis Əbu Hureyrədən رضي الله عنه rəvayət olunub.

[2] (Zəif) ət-Tirmizi /1460/, əl-Hakim 4/360.

[3] (Səhih) əl-Buxari /3156/, Əbu Davud /3043/, Əhməd 1/190-191.



Əbu Musa (əl-Əşari) رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Üç nəfər Cənnətə girməz: İçki düşgünü, qohumluq əlaqələrini kəsən və sehrə inanan”.[1]

İbn Məsud رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Bütün əfsunlar (sehr) və tilsimlər (tivalə və təmimə) şirkdir”.[2]

**Tivalə:** Qadını ərinə sevdirmək üçün istifadə olunan sehrin bir növüdür.

**Təmimə:** Gözdəymədən qorunmaq üçün istifadə olunan talisman (boyunbağı)

İnsanların çoxu, çox az bir qismi istisna olmaqla bu böyük günahlardan və onların haram olmasından xəbərsizdir. Çünki onları bu əməllərdən çəkindirən və bu haramların cəzasını xəbər verən olmayıb. Bu cür insanlara verilən hökmdə isə təfsilata ehtiyac var. Elmi olan kəs gərək cahilə hökm verməkdə tələsməsin, onunla yumşaq rəftar edərək Allahın ona bəxş etdiyi elmdən ona çatdırsın. Xüsusilə də əgər o cahillikdən yenicə yaxa qurtarmış, uzaq küfr ölkələrində yaşamış və əsir alınaraq islam torpağına gətirilmişdirsə. Təsəvvür edin ki, əvvəlcə bilməyən, müsəlman olmayan bir türkü və ya müşrik bir gürcünü elmsiz və incə zəkalı olan, şəhadətini güclə tələffüz edən, namaz qılıb qılmadığı bəlli olmayan bir türk əmiri almışdır. Əgər o hələ şəhadətinin mənasını anlayırsa bu özü böyük işdir. Bəlkə də uzun müddət sonra Fatihə surəsini ona çətinliklə də olsa öyrədə bildi. Yox əgər o da özü kimi savadsızdırsa, o

---

[1] (Həsən) Əhməd 4/399, əl-Hakim 4/146.

[2] (Həsən) Əbu Davud /3883/, ibn Məcə /3530/, Əhməd 1/381.



zaman bu yazıq İslam dininin qanunlarını, böyük günahları və onlardan uzaqlaşmağı, vacib əməlləri və onları yerinə yetirməyin təhərini haradan bilsin? Əgər bunları ona öyrədən olubsa belə, bu cür xoşbəxt insanlara çox nadir hallarda rast gəlmək olur. Ona görə gərək insan Allahın ona bəxş etdiyi nemətlərə görə Ona şükürlər etsin.

Birdən deyilsə ki, "günah onun özündədir, nə üçün gedib ona cavab verə biləcək kimsədən soruşmurdu?"

Deyərik ki, bu heç onun ağlına belə gəlməyib ki, onun bilmədiyi şeyi gedib biləndən soruşması vacibdir. Allah bir kəsə nur bəxş etməsə, onun nuru olmaz. Elmi olmayan müddətdə əgər hüccət qalxmayıbsa insan günah qazanmır, Allah öz qullarına qarşı lütfkar və rəhmlidir. Uca Allah buyurur:

وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولًا

**"Biz elçi göndərməmiş *heç kəsə* əzab vermirdik."** [əl-İsra surəsi, 15-ci ayə]

Peyğəmbərin ﷺ vaxtında ona vəhy gəldiyi zaman Həbəşistanda olan səhabələrə nazil olan vaciblər və haramlar bir neçə ay sonra gedib çatırdı və onlar vəhy onlara gedib çatmadığı müddətdə cahillikdə üzrlü sayılırdılar. Eləcə də haqqı eşitməyən hər bir şəxs üzürlü sayılır.

# Dördüncü böyük günah.
# Namazı tərk etmək.

Uca Allah buyurur:

فَخَلَفَ مِنۢ بَعۡدِهِمۡ خَلۡفٌ أَضَاعُواْ ٱلصَّلَوٰةَ وَٱتَّبَعُواْ ٱلشَّهَوَٰتِۖ فَسَوۡفَ يَلۡقَوۡنَ غَيًّا

**“Onların arxasınca namazı buraxıb şəhvətə uyan bir nəsil gəldi. Onlar ziyana uğrayacaqlar”.** [Məryəm surəsi, 59-cu ayə.]

فَوَيۡلٞ لِّلۡمُصَلِّينَ ﴿٤﴾ ٱلَّذِينَ هُمۡ عَن صَلَاتِهِمۡ سَاهُونَ

**“Vay halına namaz qılanların – o şəxslərin ki, onlar namazlarında səhlənkardırlar”.** [əl-Məun surəsi, 4-5-ci ayələr.]

مَا سَلَكَكُمۡ فِي سَقَرَ ﴿٤٢﴾ قَالُواْ لَمۡ نَكُ مِنَ ٱلۡمُصَلِّينَ

**“Sizi Səqərə salan nədir? Onlar deyəcəklər: “Biz namaz qılanlardan deyildik”.** [əl-Mudəssir surəsi, 42-43-cü ayələr]

Peyğəmbər ﷺ demişdir: “Bizimlə onların (kafirlərin) arasında olan əhd namazdır, kim onu tərk etsə, artıq küfr etmiş olur”.[1]

---

[1] (Səhih) ət-Tirmizi /2623/, ən-Nəsai 1/231-232, ibn Məcə /1079/.

Həmçinin Peyğəmbər ﷺ demişdir: “Əsr namazını vaxtından keçirənin əməlləri puç olar”.[1]

Yenə də demişdir: “İnsanla şirk arasında namazı tərk etmək durur”.[2]

Həmçinin demişdir: “Kim namazı bilə-bilə tərk edərsə Allahın zimmətindən (hifzindən) uzaqlaşar”.[3]

Ömər رضي الله عنه demişdir: “Şübhəsiz ki, namazı tərk edənin İslamda payı yoxdur”.[4]

İbrahim ən-Nəxai رضي الله عنه demişdir: “Namazı tərk edən küfr etmişdir”. Bunu Əyyub əs-Səxtiyani də demişdir.[5]

Əbu Hureyrə رضي الله عنه demişdir: “Peyğəmbərin ﷺ səhabələri namazdan başqa heç bir əməlin tərk olunmasını küfr saymırdılar”.[6]

İbn Həzm رحمه الله demişdir: Şirkdən sonra vaxtı çıxana qədər namazın tərk olunması və haqsız olaraq bir möminin öldürülməsindən böyük günah yoxdur.

Əbu Hureyrə رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Qiyamət günü insanın ilk soruşulacağı əməl namazdır, əgər namazları öz qaydasında olarsa, qalib gəlib nicata çatar, yox əgər öz qaydasında olmazsa, uduzub xəsarətə uğrayar”.[7]

---

[1] (Səhih) əl-Buxari /553 və 594/.
[2] (Səhih) Muslim /82/ Cabirin رضي الله عنه rəvayəti.
[3] (Həsən) ibn Məcə /4034/, Əhməd 6/421.
[4] (Səhih) Abdurrazzaqın “Musannaf” əsəri 3/125, Muvatta 1/39 və 51.
[5] (Səhih) ibn Abdul Bərin “ət-Təmhid” əsəri 5-343 /7136/.
[6] (Həsən) ət-Tirmizi /2624/, əl-Hakim 1/7.
[7] (Səhih) ət-Tirmizi /413/, ən-Nəsai 1/232, Əbu Davud /864/.



Peyğəmbər ﷺ demişdir: “İnsanlarla Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur və Muhəmməd onun elçisidir” – deyib, namaz qılıb, zəkat verənə qədər vuruşmağa əmr olundum. Əgər bunları etsələr islamın haqlarının ödənilməsi şərtilə qanlarını və mallarını məndən qorumuş olarlar. (Əgər küfrü gizlədərlərsə) hesabları uca Allaha aiddir”.[1]

Əbu Səid رضي الله عنه rəvayət edir ki, bir nəfər dedi ki, Ey Allahın elçisi Allahdan qorx! (Peyğəmbər ﷺ dedi: “Vay olsun sənə! Yer üzərində Allahdan ən çox qorxmağa haqlı olan mən deyiləmmi?” Bu vaxt Xalid ibn Vəlid رضي الله عنه dedi: Onun boynunu vurummu ey Allahın elçisi? (Peyğəmbər ﷺ dedi: “Yox, ola bilsin ki, o namaz qılandır”.[2]

Abdullah ibn Amr رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim namazlarını mühafizə etməzsə nurdan, dəlildən və nicata çatmaqdan məhrum olar və o Qiyamət günü Qarun, Firon, Haman və Ubey ibn Xələflə birgə olar”. Bütün bu dəlillər namazın tərk olunmasının küfr olduğunu bildirməkdədir.[3]

Peyğəmbər ﷺ Müaza رضي الله عنه demişdir: “Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur və Muhəmməd Onun qulu və elçisidir şəhadətini deyən kimsəyə Allah Cəhənnəmi haram edər”.[4]

---

[1] (Səhih) əl-Buxari /25/, Muslim /22/.
[2] (Səhih) əl-Buxari /4351/, Muslim /1064/.
[3] (Zəif) Əhməd 2/169, əd-Dərimi /2721/.
[4] (Səhih) əl-Buxari /128-129/, Muslim /32/.

Bununla bərabər namazı vaxtından gecikdirən kəs böyük günah etmiş olur. Bircə namazı tərk edən kimsə isə zina edib oğurluq edənlə eynidir, çünki hər hansı bir namazı tərk edib buraxmaq böyük günahdır. Əgər o bu əməli dəfələrlə edərsə, tövbə edənə qədər böyük günah sahiblərindən sayılar. Yox əgər namazı yerli-dibli tərk edərsə, o zaman o bədbəxt, günahkar və xəsarət çəkənlərdəndir.



## Beşinci böyük günah.
## Zəkatın ödənilməməsi.

Uca Allah buyurur:

وَوَيْلٌ لِّلْمُشْرِكِينَ ﴿٦﴾ ٱلَّذِينَ لَا يُؤْتُونَ ٱلزَّكَوٰةَ

**“Vay müşriklərin halına! O kəslərin ki, zəkat vermir...”** [Fussilət surəsi, 6-7-ci ayələr].

وَٱلَّذِينَ يَكْنِزُونَ ٱلذَّهَبَ وَٱلْفِضَّةَ وَلَا يُنفِقُونَهَا فِي سَبِيلِ ٱللَّهِ فَبَشِّرْهُم بِعَذَابٍ أَلِيمٍ ﴿٣٤﴾ يَوْمَ يُحْمَىٰ عَلَيْهَا فِي نَارِ جَهَنَّمَ فَتُكْوَىٰ بِهَا جِبَاهُهُمْ وَجُنُوبُهُمْ وَظُهُورُهُمْ هَٰذَا مَا كَنَزْتُمْ لِأَنفُسِكُمْ فَذُوقُوا۟ مَا كُنتُمْ تَكْنِزُونَ

**“Qızıl-gümüş yığıb onları Allah yolunda sərf etməyənləri ağrılı-acılı bir əzabla müjdələ. O gün bu *yığdıqları sərvətlər* Cəhənnəm odunda qızdırılacaq və bununla onların alınlarına, böyürlərinə və kürəklərinə damğa vurulacaq və *onlara:* “Budur özünüz üçün yığdıqlarınız. Elə isə dadın yığdıqlarınızı!”– *deyiləcəkdir*”** [ət-Tövbə surəsi, 34-35-ci ayələr].

Peyğəmbər ﷺ demişdir: “Haqqını ödəməyən elə bir dəvə, inək və ya qoyun sahibi yoxdur ki, qiyamət günündə düz və geniş bir yerdə bu heyvanların altına yatırılaraq, onu ayaqları ilə əzib, dişləri ilə dişləməsin. Sürünün baş tərəfi üzərindən keçdikdən sonra son tərəfi yenidən onun üzərindən keçər. Bu miqdarı əlli min il olan bir gündə qullar

arasında veriləcək hökm bitənə qədər davam edəcək. Nəhayət, ya Cənnətə, ya da Cəhənnəmə gedən yolu ona göstərilər. Xəzinəsinin haqqını ödəməyən elə bir xəzinə sahibi yoxdur ki, qiyamət günü xəzinəsi çılpaq bir ilan şəklində gəlmiş olmasın.[1]

Əbu Bəkr ﵁ zəkat verməyənlərə qarşı vuruşaraq demişdir: "Allaha and olsun ki, əgər onlar Peyğəmbərə ﷺ ödədikləri ipləri belə mənə verməzlərsə, buna görə onlarla vuruşaram".[2] Uca Allah buyurur:

وَلَا يَحْسَبَنَّ ٱلَّذِينَ يَبْخَلُونَ بِمَآ ءَاتَىٰهُمُ ٱللَّهُ مِن فَضْلِهِۦ هُوَ خَيْرًا لَّهُم ۖ بَلْ هُوَ
شَرٌّ لَّهُمْ ۖ سَيُطَوَّقُونَ مَا بَخِلُوا۟ بِهِۦ يَوْمَ ٱلْقِيَـٰمَةِ ۗ وَلِلَّهِ مِيرَٰثُ ٱلسَّمَـٰوَٰتِ
وَٱلْأَرْضِ ۗ وَٱللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ

**"Allahın Öz lütfündən bəxş etdiyini xərcləməyə xəsislik edənlər elə güman etməsinlər ki, bu, onların xeyrinədir. Əksinə, bu, onlar üçün pisdir. Onların xəsislik etdikləri şey qiyamət günü boyunlarına dolanacaqdır. Göylərin və yerin mirası Allaha məxsusdur. Allah nə etdiklərinizdən xəbərdardır".** [Ali İmran surəsi, 180-cı ayə]

Zəkatlarını ödəməyənlər barəsində Peyğəmbər ﷺ demişdir: "Kim (zəkatı) verməkdən qaçarsa, mən ondan həm zəkatı, həm də malının yarısını alaram. Bu Rəbbimin haqlarından bir haqdır".[3]

---

[1] (Səhih) əl-Buxari (1460), Muslim (987).

[2] (Səhih) əl-Buxari (1400), Muslim /20/.

[3] (Həsən) ən-Nəsai 5/15-16, Əbu Davud /1575/.

Əbu Hureyrə رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Cəhənnəm oduna girəcək üç ilk şəxs zalım sultan, var-dövləti olub Allahın haqqını ödəməyən və qürurlu kasıb olan şəxs olacaqdır”.[1]

Abdullahın رضي الله عنه belə dediyi rəvayət olunur: “Siz namaz qılıb, zəkat verməyə əmr olunmusunuz. Zəkatı ödəməyənin namazı yoxdur”.[2]

---

[1] (Çox zəif) Əhməd 2/425, əl-Həkim 1/387.

[2] (Səhih) ibn Əbi Şeybə 3/114, ət-Tabərani /10095/.



## Altıncı böyük günah.
## Valideynin üzünə ağ olmaq.

Uca Allah buyurur:

وَقَضَىٰ رَبُّكَ أَلَّا تَعْبُدُوٓاْ إِلَّآ إِيَّاهُ وَبِٱلْوَٰلِدَيْنِ إِحْسَٰنًا ۚ إِمَّا يَبْلُغَنَّ عِندَكَ ٱلْكِبَرَ أَحَدُهُمَآ أَوْ كِلَاهُمَا فَلَا تَقُل لَّهُمَآ أُفٍّ وَلَا تَنْهَرْهُمَا وَقُل لَّهُمَا قَوْلًا كَرِيمًا ﴿٢٣﴾ وَٱخْفِضْ لَهُمَا جَنَاحَ ٱلذُّلِّ مِنَ ٱلرَّحْمَةِ

**"Rəbbin yalnız Ona ibadət etməyi və ata-ana ilə yaxşı davranmağı buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında qocalıq yaşına dolarsa, onlara: "Uf!" belə demə, üstlərinə qışqırma və onlara xoş söz söylə! Onların hər ikisinə rəhm edərək təvazökarlıq qanadının altına al..."** [əl-İsra surəsi, 23-24-cü ayələr.]

وَوَصَّيْنَا ٱلْإِنسَٰنَ بِوَٰلِدَيْهِ حُسْنًا ۖ

**"Biz insana valideynləri ilə gözəl davranmağı buyurduq..."** [əl-Ənkəbüt surəsi, 8-ci ayə].

Peyğəmbər ﷺ demişdir: "Sizə ən böyük günahların hansı olduğunu xəbər verimmi?" Onlardan birinin də valideynlərə qarşı çıxmaq olduğunu qeyd etmişdir.[1]

Peyğəmbər ﷺ demişdir: "Allahın razılığı valideynin razılığında, Allahın qəzəbi valideynin qəzəbindədir".[1]

---

[1] (Səhih) əl-Buxari /2654/, Muslim /87/ Hədis Əbu Bəkradan رضي الله عنه – dan rəvayət olunmuşdur.

Həmçinin demişdir: “Ata Cənnətin orta qapısıdır. Əgər istəyirsən onu qoru, istəyirsən itir (özün bilərsən)”.[2]

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “Cənnət anaların ayaqları altındadır”.[3]

Bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib onunla cihada getməyə izn istədiyi zaman Peyğəmbər ﷺ: “valideynlərin sağdırmı?”– deyə soruşdu. O: Bəli– dediyi zaman Peyğəmbər ﷺ “get, onlarla qayğılarına qalaraq cihad apar”– söyləmişdir.[4]

Həmçinin səhabələr: kimlərə yaxşılıq edək – deyə soruşduqda, demişdir: “Anana, atana, bacına, qardaşına, sonra da daha yaxın olanlarına”.[5]

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “Valideynə qarşı çıxan, söz gəzdirən, içki içən, sehrə inanan şəxs Cənnətə girməz”.[6]

Abdullah ibn Ömər رضي الله عنه demişdir: Bir nəfər bədəvi gəlib dedi ki, Ey Allahın elçisi böyük günahlar hansılardır? (Peyğəmbər ﷺ dedi: “Allaha şərik qoşmaq”. Dedi: Sonra hansı? Dedi: “Valideynə qarşı çıxmaq”. Dedi: Sonra hansı? Dedi: Sahibini oda salan yalan and”.[7]

---

[1] (Səhih) ət-Tirmizi /1900/.
[2] (Səhih) ət-Tirmizi /1901/, Əhməd 5/196.
[3] (Uydurma hədisdir) əl-Qadai /119/, əd-Dəvləbi 2/138.
[4] (Səhih) əl-Buxari /3004/, Muslim /2549/.
[5] (Səhih) Muslim /2548/.
[6] (Səhih) ən-Nəsai 8/318, Əhməd 2/201-203.
[7] (Səhih) əl-Buxari /6675/.



Peyğəmbər ﷺ demişdir: “(Valideynlərinə) qarşı çıxan və qədəri yalanlayan şəxs Cənnətə girməz”.[1]

Amr ibn Murra əl-Cuhəni رضي الله عنه rəvayət edir ki, bir nəfər dedi: Ey Allahın elçisi! Əgər mən beş vaxt namazları qılıb, Ramazan ayında oruc tutub, zəkat verib, Həccə getsəm bunun müqabilində mənə nə verilər? Peyğəmbər ﷺ dedi: “Bunları edən şəxs Peyğəmbərlərlə, siddiqlərlə və şəhidlərlə bir yerdə olar. Yalnız valideynlərinə qarşı çıxan şəxs müstəsnadır”.[2]

Əbu Bəkrə رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Valideynə qarşı çıxmaqdan başqa bütün günahların aqibəti Qiyamət gününə saxlanılır. Onun aqibəti sahibi üçün tezləşdirilir”.[3]

Peyğəmbər ﷺ demişdir: “Oğul ata qarşısındakı (oğulluq borcunu) yalnız atası kölə olarsa, onu alıb, azad etməklə ödəyə bilər”.[4]

Sənədi həsən olan bir hədisdə Peyğəmbər ﷺ demişdir: “Allah valideynə qarşı çıxana lənət eləsin”.[5]

Həmçinin demişdir: “Xala anayla eyni dərəcədədir”.[6]

Vahb ibn Munəbbih رضي الله عنه demişdir: Uca Allah dedi: “[ey Musa] valideynlərinə hörmət et, şübhəsiz ki, Biz valideynlərinə ehtiram edənin ömrünü uzadar və ona hörmət edəcək övlad bəxş edərik, və kim valideynlərinə qarşı

---

[1] (Səhih) Əhməd 6/441, ibn Əbi Asim /321/.
[2] (Səhih) ibn Hibbən /3438/.
[3] (Həsən) əl-Hakim 4/156.
[4] (Səhih) Muslim /1510/.
[5] (Həsən) əl-Hakim 4/153.
[6] (Səhih) əl-Buxari /2699/, ət-Tirmizi /1905/.



çıxarsa, Biz onun ömrünü qısaldar və ona qarşı çıxacaq övlad verərik”.[1]

Kəb رضي الله عنه demişdir: “Canım Əlində olan Allaha and olsun ki, Allah valideynlərinə qarşı çıxan qulunun ömrünü qısaldıb ona əzab verər, və valideynlərinə hörmət edən qulunun ömrünü uzadar və ona xeyir və hörməti artırar”.[2]

Əbu Bəkr ibn əbi Məryəm demişdir: “Tövratda oxumuşam ki, atasını vuran şəxs öldürülməlidir”.[3]

Vahb رضي الله عنه demişdir: Tövratda yazılmışdır ki, Atasını vuran şəxs daşqalaq edilməlidir.[4]

---

[1] İbn Həcər əl-Heysəmi. “əz-Zəvəcir ən iqtiraf əl-Kəbəir” əsəri, 2/71.

[2] Əvvəlki mənbə.

[3] Əvvəlki mənbə.

[4] Əvvəlki mənbə.

## Yeddinci böyük günah.
## Faiz yemək.

Uca Allah buyurur:

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ ٱتَّقُوا۟ ٱللَّهَ وَذَرُوا۟ مَا بَقِىَ مِنَ ٱلرِّبَوٰٓا۟ إِن كُنتُم مُّؤْمِنِينَ ﴿٢٧٨﴾ فَإِن لَّمْ تَفْعَلُوا۟ فَأْذَنُوا۟ بِحَرْبٍ مِّنَ ٱللَّهِ وَرَسُولِهِۦ

**“Ey iman gətirənlər! Allahdan qorxun və əgər möminsinizsə, sələmdən qalan faizi almayın. Bunu etməsəniz, Allahın və Onun Elçisinin sizə müharibə elan etdiyini bilin...”** [əl-Bəqərə surəsi, 278-279-ci ayələr]

ٱلَّذِينَ يَأْكُلُونَ ٱلرِّبَوٰا۟ لَا يَقُومُونَ إِلَّا كَمَا يَقُومُ ٱلَّذِى يَتَخَبَّطُهُ ٱلشَّيْطَٰنُ مِنَ ٱلْمَسِّ

**“Sələm yeyənlər *qəbirlərindən* şeytan toxunub dəli eləmiş kimsənin qalxdığı kimi qalxarlar…”** [əl-Bəqərə surəsi, 275-ci ayə]

Gördüyün kimi, bütün bunlar nəsihət edildikdən sonra yenidən faizə qayıdan kəsin əbədi (və ya uzun müddət) Cəhənnəmdə əzab olunacağına böyük bir təhdiddir. Allahdan başqa güc, qüvvət sahibi yoxdur.

Peyğəmbər ﷺ demişdir: “(Sahibini) həlak edən yeddi əməldən çəkinin”. Onlardan birinin də faiz yemək olduğunu bildirmişdir.[1]

Peyğəmbər ﷺ demişdir: “Allah faiz yeyənə də, yedirdənə də lənət eləsin”. Tirmizinin rəvayətində isə: “Ona (faizə) şahidlik edənlərə və yazanlara da (lənət eləsin)” əlavəsi vardır.[2]

Peyğəmbər ﷺ demişdir: “Faizin haram olmasını bilib, onu yeyən, yedirdirən və onu yazan şəxs, Qiyamət günü Muhəmmədin ﷺ dili ilə lənətlənəcəklər”.[3]

[1] (Səhih) əl-Buxari /2766/, Muslim /89/ Hədis Əbu Hureyrədən رضي الله عنه rəvayət olunub.

[2] (Səhih) Muslim /1597/.

[3] (Səhih) ən-Nəsai 8/147, Əhməd 1/409.



# Səkkizinci böyük günah.
# Yetimin malını haqsızlıqla yemək.

Uca Allah buyurur:

إِنَّ ٱلَّذِينَ يَأۡكُلُونَ أَمۡوَٰلَ ٱلۡيَتَٰمَىٰ ظُلۡمًا إِنَّمَا يَأۡكُلُونَ فِي بُطُونِهِمۡ نَارٗاۖ
وَسَيَصۡلَوۡنَ سَعِيرٗا

**“Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlər öz qarınlarına ancaq od doldururlar və onlar yandırıb-yaxan oda girəcəklər”** [ən-Nisa surəsi, 10-cu ayə].

وَلَا تَقۡرَبُواْ مَالَ ٱلۡيَتِيمِ إِلَّا بِٱلَّتِي هِيَ أَحۡسَنُ حَتَّىٰ يَبۡلُغَ أَشُدَّهُۥۖ

**“Yetim həddi-buluğa çatana qədər, – xeyirxahlıq (qoruyub saxlamaq və artırmaq məqsədilə istifadə etmək) istisna olmaqla, – onun malına yaxınlaşmayın!”** [əl-Ənam surəsi, 152-ci ayə]

Peyğəmbər ﷺ demişdir: “(Sahibini) həlak edən yeddi əməldən çəkinin”. Onlardan birinin də yetimin malını haqsızlıqla yemək olduğunu qeyd etmişdir.[1]

Lakin əgər yetimə baxan şəxs kasıbdırsa, ehtiyacı olan qədər yetimin malından yeyərsə heç nə olmaz. Ehtiyacından artıq yemək isə qadağan və haramdır. Ehtiyacın miqdarına gəldikdə isə bu çirkin niyyətlərdən uzaq olan mömin insanların adətinə görə müəyyən edilir.

---

[1] (Səhih) əl-Buxari /2766/, Muslim /89/ Hədis Əbu Hureyrədən رضي الله عنه rəvayət olunub.

# Doqquzuncu böyük günah.
# Peyğəmbərin ﷺ adından yalan söyləmək.

Peyğəmbərin ﷺ adından yalan danışmaq insanı İslam millətindən çıxaran bir küfrdür və şübhəsiz ki, haramları halal, halalları isə haram etməklə bilərəkdən Allahın və ya Onun elçisinin adından yalan söyləmək açıq küfrdür. Burada isə başqa əməllər nəzərdə tutulur.

Peyğəmbər ﷺ demişdir: "Mənim adımdan yalan danışmaq başqa birisinin adından danışılan yalanla eyni deyildir. Mənim adımdan yalan danışan Cəhənnəmdəki yerini hazır bilsin".[1]

Həmçinin ﷺ demişdir: "Mənim adımdan yalan danışana Cəhənnəmdə ev tikilər".[2]

Başqa bir hədisdə demişdir: "Mənim demədiyim bir şeyi mənim adımdan deyən şəxs Cəhənnəmdəki yerini hazır bilsin".[3]

Peyğəmbər ﷺ demişdir: "Mömin bir şəxsin yalan və xəyanətdən başqa hər bir şeyə meyl etməsi mümkündür".[4]

Həmçinin ﷺ demişdir: "Yalan olduğunu bilərək mənim adımdan hədis rəvayət edən şəxs yalançılardan biridir".[5]

Bununla da bilmək lazımdır ki, (*məvdu*) uydurma hədisi rəvayət etmək haramdır.

---

[1] (Səhih) əl-Buxari /1291/, Muslim /4/.
[2] (Səhih) Əhməd 2/22 və 103.
[3] (Səhih) Əhməd 2/171, ibn Məcə /35/.
[4] (Zəif) Əhməd 5/252, ibn əbi Asim /114/.
[5] (Səhih) əl-Buxari /1291/, Muslim /4/.



# Onuncu böyük günah.
# Üzr və rüxsət olmadan Ramazanda orucu pozmaq.

Peyğəmbər ﷺ demişdir: "Üzr və rüxsət olmadan Ramazan orucunun bir gününü pozan şəxs, bütün ömrünü oruc tutsa belə onun qəzasını edə bilməz".[1]

Peyğəmbər ﷺ demişdir: "Beş vaxt namaz, cümədən növbəti cüməyə və Ramazandan növbəti Ramazana qədər edilən günahlar, böyük günahlar istisna olmaqla kəffarədir".[2]

Həmçinin ﷺ demişdir: "İslam beş şey üzərində bina edilmişdir: Allahdan başqa ibadətə layiq məbudun olmaması və Muhəmmədin Onun elçisi olmasına şəhadət etmək, namaz qılmaq, zəkat vermək, Ramazan orucunu tutmaq və Həcc ziyarəti etmək".[3]

İbn Abbasın رضي الله عنه belə dediyi rəvayət olunur: "İslamın əsasları və dinin qaydaları üçdür: Allahdan başqa ibadətə layiq məbud yoxdur şəhadəti, namaz və Ramazan orucu. Bunlardan birini tərk edən kafirdir".[4]

Möminlərə gəldikdə isə, onlar üçün məlumdur ki, Ramazan orucunu xəstəlik olmadan, səbəbsiz yerə tərk edən şəxs, zinakardan, insanların mallarının bir hissəsini

---

[1] (Zəif) ət-Tirmizi /723/, Əbu Davud /2396/.

[2] (Səhih) Muslim /233/ Hədis Əbu Hureyrədən رضي الله عنه rəvayət olunub.

[3] (Səhih) əl-Buxari /8/, Muslim /16/.

[4] (Zəif) Əbu Yələ /2349/.



zorla alandan, sərxoşluq edən şəxsdən daha pisdir. Hətta həmin şəxsin islam dini üzərində olmasında belə şübhə edərək, o şəxsi yolunu azmış münafiqlərdən sayırlar.

Peyğəmbər ﷺ demişdir: “Yalan danışmağı və cahilliyi tərk etməyən şəxsin ac və susuz qalmasına Allahın ehtiyacı yoxdur”.[1]

Həmçinin ﷺ demişdir: “Ramazan ayına yetişib bağışlanmamış olanın burnu sürtülsün”.[2]

[1] (Səhih) əl-Buxari /1903/.
[2] (Səhih) ət-Tirmizi /3539/.



# On birinci böyük günah. Döyüş meydanından qaçmaq.

Uca Allah buyurur:

وَمَن يُوَلِّهِمْ يَوْمَئِذٍ دُبُرَهُۥٓ إِلَّا مُتَحَرِّفًا لِّقِتَالٍ أَوْ مُتَحَيِّزًا إِلَىٰ فِئَةٍ فَقَدْ بَآءَ بِغَضَبٍ مِّنَ ٱللَّهِ وَمَأْوَىٰهُ جَهَنَّمُ ۖ وَبِئْسَ ٱلْمَصِيرُ

**"Daha bir döyüş əməliyyatı keçirmək üçün bir tərəfə çəkilən və ya başqa bir dəstəyə qoşulanlar istisna olmaqla, kim belə bir gündə onlara arxa çevirərsə, Allahın qəzəbinə düçar olar. Onun sığınacağı yer Cəhənnəmdir. Ora necə də pis dönüş yeridir"** [əl-Ənfal surəsi, 16-cı ayə].

Peyğəmbər ﷺ demişdir: "(Sahibini) həlak edən yeddi böyük günahdan çəkinin". Onlardan birinin də döyüşdən qaçmaq olduğunu qeyd etmişdir.[1]

[1] (Səhih) əl-Buxari /2766/, Muslim /89/ Hədis Əbu Hureyrədən رضي الله عنه rəvayət olunub.



# On ikinci böyük günah. Zina. Onun bəzi növləri, digərlərindən daha böyük günahdır.

Uca Allah buyurur:

وَلَا تَقْرَبُوا۟ ٱلزِّنَىٰٓ ۖ إِنَّهُۥ كَانَ فَٰحِشَةً وَسَآءَ سَبِيلًا

**“Zinaya yaxınlaşmayın. Çünki bu, iyrənc bir əməl və murdar bir yoldur!”** [əl-İsra surəsi, 32-ci ayə].

وَٱلَّذِينَ لَا يَدْعُونَ مَعَ ٱللَّهِ إِلَٰهًا ءَاخَرَ وَلَا يَقْتُلُونَ ٱلنَّفْسَ ٱلَّتِى حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلْحَقِّ وَلَا يَزْنُونَ ۚ وَمَن يَفْعَلْ ذَٰلِكَ يَلْقَ أَثَامًا ﴿٦٨﴾ يُضَٰعَفْ لَهُ ٱلْعَذَابُ يَوْمَ ٱلْقِيَٰمَةِ وَيَخْلُدْ فِيهِۦ مُهَانًا ﴿٦٩﴾ إِلَّا مَن تَابَ وَءَامَنَ وَعَمِلَ عَمَلًا صَٰلِحًا

**“Onlar Allahla yanaşı başqa məbuda yalvarmaz, Allahın haram etdiyi cana haqsız yerə qıymaz və zina etməzlər. Bunu edən kimsə cəzalandırılar. Qiyamət günü onun əzabı qat-qat artırılar və onun içində zəlil olub əbədi qalar. Ancaq tövbə edib iman gətirən və saleh əməllər edənlərdən başqa...”** [əl-Furqan surəsi, 68-70-ci ayələr].

ٱلزَّانِيَةُ وَٱلزَّانِى فَٱجْلِدُوا۟ كُلَّ وَٰحِدٍ مِّنْهُمَا مِا۟ئَةَ جَلْدَةٍ ۖ وَلَا تَأْخُذْكُم بِهِمَا رَأْفَةٌ فِى دِينِ ٱللَّهِ إِن كُنتُمْ تُؤْمِنُونَ بِٱللَّهِ وَٱلْيَوْمِ ٱلْءَاخِرِ ۖ

**“Zinakar qadının və zinakar kişinin hər birinə yüz çubuq vurun. Əgər Allaha və axirət gününə inanırsınızsa, Allahın dininə görə onlara yazığınız gəlməsin...”** [ən-Nur surəsi, 2-ci ayə].

ٱلزَّانِى لَا يَنكِحُ إِلَّا زَانِيَةً أَوْ مُشْرِكَةً وَٱلزَّانِيَةُ لَا يَنكِحُهَآ إِلَّا زَانٍ أَوْ مُشْرِكٌ ۚ وَحُرِّمَ ذَٰلِكَ عَلَى ٱلْمُؤْمِنِينَ

**“Zinakar kişi ancaq zinakar və ya müşrik bir qadınla evlənə bilər. Zinakar qadın da yalnız zinakar və ya müşrik bir kişiyə ərə gedə bilər. Möminlərə isə bu, haram edilmişdir”** [ən-Nur surəsi, 3-cü ayə].

Peyğəmbərdən ﷺ: ən böyük günah hansıdır? – deyə soruşulduqda o demişdir: “Səni yaradanın Allah olmasına baxmayaraq, Ona şərik qoşmaq”. Sonra hansıdır? – deyə soruşulduqda dedi ki, “sənin yeməyindən yeyəcəyindən (sənin ruzinə ortaq olacağından) qorxub uşağını öldürmək”. Sonra hansıdır? – deyə soruşulduqda dedi ki, “Qonşunun xanımı ilə zina etmək”.[1]

Peyğəmbər ﷺ demişdir: “Zina edən şəxs zina etdiyi müddətdə mömin deyil, oğurluq edən şəxs də bunu etdiyi müddətdə mömin deyil və içki içən də bunu etdiyi müddətdə mömin deyildir”. [2]

[1] (Səhih) əl-Buxari /4477/, Muslim /86/. Hədis Abdullah ibn Məsuddan rəvayət edilmişdir.

[2] (Səhih) əl-Buxari /2475/, Muslim /57/.

Peyğəmbər ﷺ demişdir: "İnsan zina etdiyi zaman imanı onu tərk edərək kölgə kimi onun üzərində olur. Bunu bitirdikdən sonra imanı yenidən qayıdır".[1]

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur ki, "Allah zina edən və ya içki içən şəxsdən onun imanını, köynəyini başından çıxarıb soyunduğu kimi alıb çıxarar".[2]

Həmçinin ﷺ demişdir: "Allah Qiyamət günü üç şəxsi danışdırmaz, onları təmizə çıxarmaz, onlara nəzər salmaz və onlara ağrıdıcı əzab verər: zinakarlıq edən yaşlı, yalançı hökmdar və təkəbbürlü kasıb".[3]

Peyğəmbər ﷺ demişdir: "Döyüşdə olmayanlar üçün mücahidlərin xanımlarının toxunulmazlığı onların analarının toxunulmazlığı kimidir. Mücahidlərdən kimsə öz ailəsinə himayə duracaq birini tərk etdikdən sonra, o şəxs onun ailəsinə xəyanət edərsə. Qiyamət günü onunla qarşı-qarşıya durar və onun əməllərindən istədiyi qədər götürər. Bəs nə bilmişdiniz?".[4]

Həmçinin ﷺ demişdir: "Dörd nəfərə Allah nifrət edər: Çox and-aman edən satıcı, lovğalıq edən kasıb, zinakarlıq edən yaşlı və zalım başçı".[5]

Zinanın ən dəhşətlisi isə insanın öz anası, bacısı, atasının xanımı və öz məhrəmləri ilə etdiyi zinadır.

əl-Hakim aşağıdakı hədisə səhih dediyinə görə məsuliyyəti də onun boynundadır:

---

[1] (Səhih) ət-Tirmizi /2627/, Əbu Davud /4690/, əl-Hakim 1/22.

[2] (Zəif) əl-Hakim 1/22.

[3] (Səhih) Muslim /107/.

[4] (Səhih) Muslim /1797/.

[5] (Səhih) ən-Nəsai 5/86, ibn Hibban /5558/.

“Öz məhrəmiylə zina edən kəsi öldürün”.[1]

Bu fəsildə başqa hədislər də vardır. Onlardan biri də:

Bəranın رضي الله عنه hədisidir ki, “Peyğəmbər ﷺ onun dayısını, öz atasının xanımına yaxınlıq edən bir nəfəri öldürüb, onun malını beş yerə bölmək üçün göndərmişdi”.[2]

---

[1] (Zəif) ət-Tirmizi /1462/, ibn Məcə /2564/.

[2] (Səhih) ət-Tirmizi /1362/, ən-Nəsai 6/109-110. Əbu Davud /4456-4457/.



# On üçüncü böyük günah. Öz camaatını aldadan, zülmkarlıq edən hökmdar (diktator)

Uca Allah buyurur:

إِنَّمَا ٱلسَّبِيلُ عَلَى ٱلَّذِينَ يَظْلِمُونَ ٱلنَّاسَ وَيَبْغُونَ فِى ٱلْأَرْضِ بِغَيْرِ ٱلْحَقِّ ۚ أُو۟لَٰٓئِكَ لَهُمْ عَذَابٌ أَلِيمٌ

**"Məzəmmət olunmağa ancaq insanlara zülm edənlər və yer üzündə haqsız yerə azğınlıq edənlər layiqdirlər. Məhz onlar üçün ağrılı-acılı əzab vardır"** [əş-Şura surəsi, 42-ci ayə].

كَانُوا۟ لَا يَتَنَاهَوْنَ عَن مُّنكَرٍ فَعَلُوهُ ۚ لَبِئْسَ مَا كَانُوا۟ يَفْعَلُونَ

**"Onlar bir-birlərini etdikləri pis əməllərdən çəkindirmirdilər. Onların etdikləri necə də pisdir!"** [əl-Maidə surəsi, 79-cu ayə].

Peyğəmbər ﷺ demişdir: "Hər biriniz məsulsunuz və hər biriniz himayəniz altında olan şəxslər barəsində məsuliyyət daşıyırsınız".[1]

Peyğəmbər ﷺ demişdir: "Bizə hiylə gəlib, bizi aldadan şəxs bizdən deyildir".[2]

[1] (Səhih əl-Buxari /893/, Muslim /1829/.

[2] (Səhih) Muslim /101/.

Peyğəmbər ﷺ demişdir: "(Bu dünyada edilən) zülm (haqsızlıq) Qiyamət günü zülümətlərə çevriləcəkdir".[1]

Həmçinin ﷺ demişdir: "Hər bir məsuliyyət sahibi öz məsuliyyəti altında olanlara hiylə gələrək onları aldadarsa, Cəhənnəmlikdir".[2]

Həmçinin ﷺ demişdir: "Kim, Allah onu məsuliyyət sahibi etdikdən sonra məsuliyyəti altında olan şəxslərə nəsihət etməzsə, Allah Cənnəti ona haram edər".[3]

Başqa ləfzdə isə: "Kim məsuliyyəti altında olan şəxslərə hiylə gəlib, onları aldadaraq, ölərsə, Allah Cənnəti ona haram edər". Digər ləfzdə: "Həmin şəxs Cənnətin qorxusunu belə duymaz" – deyə buyurmuşdur.

Həmçinin ﷺ demişdir: "Onca nəfərə əmirlik (başçılıq) edən hər bir kəs əlləri boynunda bağlı halda gətiriləcəkdir. Ya onun adilliyi onu azad edəcək, ya da onun zülmkarlığı onu o vəziyyətdə saxlayacaqdır".[4]

Peyğəmbər ﷺ demişdir: "Allahım bu ümmətin hər hansı bir işində əmir sahibi olub, rəiyyəti altında olanlarla nəzakətlə davranan şəxslə Sən də nəzakətlə davran. Onları narahat edəni isə Sən də narahat et".[5]

Peyğəmbər ﷺ demişdir: "Fasiq və zülmkar əmirlər olacaq. Onların yalanlarını təsdiqləyən və onların etdikləri haqsızlığa yardım edən şəxs məndən deyil, mən də ondan

[1] (Səhih) əl-Buxari /2447/, Muslim /2579/.
[2] (Səhih) əl-Buxari /7151/, Muslim /142/.
[3] (Səhih) əl-Buxari /7150/, Muslim /142/.
[4] (Səhih) Əhməd 5/267.
[5] (Səhih) Muslim /1828/.



deyiləm və həmin şəxs mənim yanıma hovuza gəlməyəcəklər”.[1]

Həmçinin ﷺ demişdir: “Özləri güclü və sayca çox olduqları halda aralarında günahlar edilərkən, onların bu əməllərinə mane olmayan qövmə Allah ümumi bəla verər.[2]

Abdullah ibn Məsud رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Canım Əlində olan Allaha and olsun ki, siz ya yaxşı işlərə dəvət edəcək, pis əməllərdən çəkindirəcək, səhv edənin əlindən tutub, onunla şəfqətlə davranaraq onu haqqa yönəldəcəksiniz, ya da Allah bəzilərinizin qəlblərini digər qism insanlara çevirib, sonra da İsrail oğullarının lənətləndiyi kimi Məryəm oğlu İsa və Davudun dili ilə lənətlənmiş olacaqısnız”.[3]

Məqal ibn Yəsər رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Ümmətimdən iki qrup insan mənim şəfaətimə nail ola bilməyəcəkdir: zülmkar və ədalətsiz hökmdar və dində həddini aşan şəxs. O, onlar əleyhinə şahidlik edib, onlardan uzaqlaşacaqdır”.[4]

Əbu Səid əl-Xudri رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qiyamət günü ən şiddətli əzab çəkən, zülmkar imam olacaqdır.[5]

Peyğəmbər ﷺ demişdir: “Ey insanlar! Allaha dua edib, Ondan bağışlanma dilədiyiniz zaman, cavab verməyib sizi bağışlamayacağı vaxt gəlməmiş, yaxşı işlərə dəvət edib, pis

[1] (Həsən) ət-Tirmizi /614/, ən-Nəsai 7/160.

[2] (Səhih) Əbu Davud /4339/, ibn Məcə /4009/, Əhməd 4/361.

[3] (Zəif) ət-Tirmizi /3050/, Əbu Davud /4336/.

[4] (Həsən) ibn əbi Asimin “Sünnə” əsəri /35/.

[5] (Zəif) ət-Tirmizi /1329/, Əhməd 3/22.



işlərdən çəkindirin. Həqiqətən yəhudi alimləri və nəsrani rahibləri yaxşı işlərə dəvət edib, pis işlərdən çəkindirməyi tərk etdikləri zaman, Allah onlara Peyğəmbərlərinin dili ilə lənət etmiş və onlara ümumi bəla göndərmişdir".[1]

Peyğəmbər ﷺ demişdir: "Kim bizim dinimizdən olmayan bir şeyi dinimizə əlavə edərsə, onun bu əməli rədd olunar".[2]

Həmçinin ﷺ demişdir: "Kim yenilik edər və ya yenilik edənə sığınarsa, onun üzərinə Allahın, mələklərin və insanların hamısının lənəti olar və həmin şəxsdən nə fərz, nə də nafilə qəbul edilməz".[3]

Peyğəmbər ﷺ demişdir: "Rəhm etməyən şəxsə rəhm olunmaz".[4]

Həmçinin demişdir: "İnsanlara rəhm etməyənə Allah da rəhm etməz".[5]

Peyğəmbər ﷺ demişdir: "Müsəlmanlara əmir təyin edildikdən sonra onlar üçün çalışıb, onlara nəsihət etməyən, onlarla Cənnətə girməz".[6]

Həmçinin ﷺ belə demişdir: "Kim, Allah onu müsəlmanlara hakim təyin etdikdən sonra müsəlmanların ehtiyac, kasıblıq və yoxsulluqlarına göz yumarsa, Qiyamət

---

[1] (Həsən) Əbu Nueymin "əl-Huliyyə" əsəri 8/287, ət-Təbərani /1389/ "Mucəm əl-Əvsat".

[2] (Səhih) əl-Buxari 5/60, Muslim /1718/.

[3] (Səhih) əl-Buxari /1876/, Muslim /1370/.

[4] (Səhih) əl-Buxari /6013/, Muslim /2318/.

[5] (Səhih) əl-Buxari /6031/, Muslim /2319/.

[6] (Səhih) əl-Buxari /7150/, Muslim /142/.



günü də Allah onun ehtiyac, kasıblıq və yoxsulluğuna əhəmiyyət verməz”[1].

Peyğəmbər ﷺ demişdir: “Allah adil başçını ərşin kölgəsində kölgələndirəcəkdir”[2].

Həmçinin ﷺ demişdir: “Əhalisinə və rəiyyətinə qarşı öz hökmlərində adil olanlar nurdan olan minbərlər üzərində olacaqlar”[3].

Həmçinin ﷺ demişdir: “Sizin ən pis başçılarınız o kəslərdir ki, siz onlara nifrət edirsiniz, onlar da sizə, siz onlara lənət edirsiniz, onlar da sizə”. Dedilər ki, Ey Allahın elçisi, onları tərk etməyəkmi? Dedi : Nə qədər ki sizinlə namaz qılırlar, yox”[4].

Peyğəmbər ﷺ demişdir: “Allah zalım insana uzun müddət möhlət verər, onu əzabla yaxaladığı zaman isə onu həlak olmaqdan qurtarmaz”. Sonra o, bu ayəni oxudu:

وَكَذَٰلِكَ أَخْذُ رَبِّكَ إِذَآ أَخَذَ ٱلْقُرَىٰ وَهِىَ ظَٰلِمَةٌ ۚ إِنَّ أَخْذَهُۥٓ أَلِيمٌ شَدِيدٌ

**“Rəbbin, haqsızlıq edən məmləkətləri yaxaladığı zaman belə yaxalayır. Onun yaxalaması həqiqətən də, üzücüdür, şiddətlidir”** [Hud surəsi, 102-ci ayə].[5]

Peyğəmbər ﷺ Müazı رضي الله عنه Yəmənə göndərdiyi zaman ona demişdir: “Onların xeyirli və bahalı mal-dövlətlə-

[1] (Həsən) ət-Tirmizi /1332-1333/, Əbu Davud /2948/.
[2] (Səhih) əl-Buxari /423/, Muslim /1031/.
[3] (Səhih) Muslim /1827/.
[4] (Səhih) Muslim /1855/.
[5] (Səhih) əl-Buxari /4686/, Muslim /2583/.



rindən çəkin və məzlumun duasından qorx. Çünki onunla Allah arasında heç bir hicab yoxdur".[1]

Həmçinin ﷺ demişdir: "Başçıların ən pisi hutamələrdir*."[2]

Peyğəmbər ﷺ demişdir: "Allah üç şəxsi danışdırmaz..." – onlardan birinin də yalançı hökmdar olduğunu bildirmişdir.[3]

Uca Allah buyurur:

تِلْكَ ٱلدَّارُ ٱلْءَاخِرَةُ نَجْعَلُهَا لِلَّذِينَ لَا يُرِيدُونَ عُلُوًّا فِى ٱلْأَرْضِ وَلَا فَسَادًا ۚ وَٱلْعَٰقِبَةُ لِلْمُتَّقِينَ

**"Biz o Axirət yurdunu yer üzündə təkəbbürlük etmək və fitnə-fəsad törətmək istəməyənlərə nəsib edirik. *Gözəl* aqibət müttəqilərindir"** [əl-Qasas surəsi, 83-cü ayə].

Peyğəmbər ﷺ demişdir: "Həqiqətən siz başçı olmağa həris olacaqsınız. Sizin bu əməliniz isə Qiyamət günü peşimançılığa çevriləcək".[4]

Peyğəmbər ﷺ demişdir: "Allaha and olsun ki, biz bunu (başçı olmağı) ona həris olub, onu istəyən şəxsə həvalə etmərik".[5]

---

[1] (Səhih) əl-Buxari (1395), Muslim /19.

* Hutamə – bazarda dəvələrin alqı-satqısına kobudcasına nəzarət edən kəsə deyilir. O, dəvələri bir-birinə qataraq zülm edər. Bu pis başçılar üçün çəkilən məsəldir.

[2] (Səhih) Muslim /1830/.

[3] (Səhih) Muslim /107/.

[4] (Səhih) əl-Buxari /7148/.

[5] (Səhih) əl-Buxari /2261/, Muslim /1733/.



Həmçinin ﷺ demişdir: “Ey Kəb ibn Ucrah, Allah səni səfeh başçılardan qorusun. O başçılardan ki, onlar məndən sonra olub mənim rəhbərliyimdən örnək götürməyib, mənim yolumla getməzlər”.[1]

Həmçinin ﷺ demişdir: “Üç növ duanın qəbul olmasında şübhə yoxdur: məzlumun duası, Musafirin (Səfərdə olan şəxsin) duası və valideynin öz övladına etdiyi dua”.[2]

[1] (Səhih) ibn Hibban /4514/, Abdur-Razzaq /20719/. əl-Həkim 4/422.
[2] (Səhih) ət-Tirmizi /1906/, Əbu Davud /1536/, ibn Məcə /3862/.



# On dördüncü böyük günah.
# İçki içmək
# (sərxoş etməyəcək qədər olsa belə).

Uca Allah buyurur:

يَسْـَٔلُونَكَ عَنِ ٱلْخَمْرِ وَٱلْمَيْسِرِ ۖ قُلْ فِيهِمَآ إِثْمٌ كَبِيرٌ وَمَنَٰفِعُ لِلنَّاسِ وَإِثْمُهُمَآ أَكْبَرُ مِن نَّفْعِهِمَا ۗ

**"Səndən sərxoşedici *içki* və qumar barəsində soruşurlar. De: "İkisində də həm böyük günah, həm də insanlar üçün mənfəət vardır. Amma günahları mənfəətlərindən daha böyükdür"** [əl-Bəqərə surəsi, 219-cu ayə].

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓا۟ إِنَّمَا ٱلْخَمْرُ وَٱلْمَيْسِرُ وَٱلْأَنصَابُ وَٱلْأَزْلَٰمُ رِجْسٌ مِّنْ عَمَلِ ٱلشَّيْطَٰنِ فَٱجْتَنِبُوهُ لَعَلَّكُمْ تُفْلِحُونَ

**"Ey iman gətirənlər! Şübhəsiz ki, sərxoşedici *içki* də, qumar da, *tapınmaq məqsədilə* dik qoyulmuş daşlar da, fal oxları da şeytan əməlindən olan murdar şeylərdir. Bunlardan çəkinin ki, bəlkə nicat tapasınız"** [əl-Maidə surəsi, 90-cı ayə].

İbn Abbasın ﷺ belə dediyi rəvayət olunub: "İçkinin haram olması barədə ayə nazil olduğu zaman səhabələr



bir-birilərinin yanına gedib: “İçki haram olunaraq şirkə bərabər edildi” – deyirdilər”.[1]

Abdullah ibn Ömər رضي الله عنه isə günahların ən böyüyünün içki içmək olduğunu demişdir. Şübhəsiz ki, içki pisliklərin anasıdır və onu içənə lənət edilməsi haqqında bir sıra hədislər variddir.

Peyğəmbər ﷺ demişdir: “İçki içən şəxsi kötəkləyin, yenə içərsə, yenə də kötəkləyin, dördüncü dəfə yenə içərsə, onu öldürün”.[2]

Abdullah ibn Amr رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Bir dəfə sərxoşluğundan dolayı namazını tərk edən şəxsin misalı, bütün dünya və onun üzərindəkilər ona məxsus ikən, əlindən zorla qəsd edilərək alınan şəxs kimidir”. Kim şərxoşluğu ucbatından dörd dəfə namazı tərk edərsə, o şəxsə Xəbəl palçığı içirtmək Allaha borc olar”. Dedilər: Xəbəl palçığı nədir? O: “Cəhənnəm əhlinin içkisi”– deyə cavab verdi.[3]

Cabir رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Şübhəsiz ki, sərxoşedici içki içən şəxsə Xəbəl palçığı içirtmək Allahın əhdidir”. Dedilər: Xəbəl palçığı nədir? O: “Cəhənnəm əhlinin təri”, və ya “Cəhənnəm əhlinin içkisi”– dedi.[4]

Peyğəmbər ﷺ demişdir: “Bu dünyada içki içən, axirətdə ondan məhrum olar”. [5]

---

[1] (Səhih) ət-Təbərani /12399/.

[2] (Səhih) ət-Tirmizi /1444/, Əbu Davud /4482/, ibn Məcə /2573/.

[3] (Həsən) Əhməd 2/178, əl-Hakim 4/146.

[4] (Səhih) Muslim /2002/.

[5] (Səhih) əl-Buxari /5575/, Muslim /2003/.



Həmçinin Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “Daim sərxoş olan şəxs ölərsə, Allahla bütə ibadət edən kimi görüşər”.[1]

[1] (Həsən) Əhməd 1/272, ibn Məcə /3375/.



## On beşinci böyük günah.
## Təkəbbürlük, iftixar, özünü bəyənmək, qürurlanma və lovğalıq.

Uca Allah buyurur:

وَقَالَ مُوسَىٰٓ إِنِّي عُذْتُ بِرَبِّي وَرَبِّكُم مِّن كُلِّ مُتَكَبِّرٍ لَّا يُؤْمِنُ بِيَوْمِ ٱلْحِسَابِ

**"Musa dedi: "Mən hesablaşma gününə inanmayan hər bir təkəbbürlüdən həm mənim Rəbbim, həm də sizin Rəbbiniz *olan Allaha* sığınıram!"** [Ğafir surəsi, 27-ci ayə.]

إِنَّهُۥ لَا يُحِبُّ ٱلْمُسْتَكْبِرِينَ

**"Həqiqətən də, O, təkəbbürlü olanları sevmir"** [ən-Nəhl surəsi, 23-cü ayə].

إِنَّ ٱلَّذِينَ يُجَٰدِلُونَ فِيٓ ءَايَٰتِ ٱللَّهِ بِغَيْرِ سُلْطَٰنٍ أَتَىٰهُمْ إِن فِي صُدُورِهِمْ إِلَّا كِبْرٌ مَّا هُم بِبَٰلِغِيهِ فَٱسْتَعِذْ بِٱللَّهِ

**"Həqiqətən, özlərinə bir dəlil gəlmədən Allahın ayələri barəsində mübahisə edənlərin ürəklərində böyüklük iddiasından başqa bir şey yoxdur. Onlar heç vaxt buna çatmayacaqlar. Sən Allaha sığın!.."** [Ğafir surəsi, 56-cı ayə]



Peyğəmbər ﷺ demişdir: "Qəlbində zərrə qədər təkəbbürlük olan şəxs Cənnətə girməz".[1]

Peyğəmbər ﷺ demişdir: "Bir adam özünü bəyənib, libası ilə lovğalanaraq gəzərkən Allah onu yerə batırmışdır və o qiyamətə qədər yerə batmaqda davam edəcəkdir".[2]

Peyğəmbər ﷺ demişdir: "Böyüklənənlər və təkəbbürlülər Qiyamət günü kiçicik qarışqalar boyda olacaq, insanlar onları tapdalayacaqlar".[3]

Bəzi sələflər, Allaha qarşı törədilən ilk günahın təkəbbürlük olduğunu demişlər. Uca Allah buyurur:

وَإِذْ قُلْنَا لِلْمَلَٰٓئِكَةِ ٱسْجُدُوا۟ لِءَادَمَ فَسَجَدُوٓا۟ إِلَّآ إِبْلِيسَ أَبَىٰ وَٱسْتَكْبَرَ وَكَانَ مِنَ ٱلْكَٰفِرِينَ

**"Bir zaman Biz mələklərə: "Adəmə səcdə edin!"– dedikdə, İblisdən başqa *hamısı* səcdə etdi. O imtina edib təkəbbür göstərdi və kafir oldu"** [əl-Bəqərə surəsi, 34-cü ayə].

Ona görə İblis kimi haqqa qarşı təkəbbürlük göstərən şəxsə, onun imanı fayda verməz.

Peyğəmbər ﷺ demişdir: "Təkəbbürlük haqqı danma və insanları özündən aşağı səviyyədə görməkdir". Muslimin rəvayət etdiyi ləfz isə belədir: "Təkəbbürlük haqqı qürurlanaraq qəbul etməmək və insanları özündən aşağı görməkdir".[4]

---

[1] (Səhih) Muslim /91/.
[2] (Səhih) əl-Buxari /5789/, Muslim /2088/.
[3] (Həsən) ət-Tirmizi /2494/, Əhməd 2/179.
[4] (Səhih) Əhməd 4/133-134, Muslim /91/.

Uca Allah buyurur:

إِنَّ ٱللَّهَ لَا يُحِبُّ كُلَّ مُخْتَالٍ فَخُورٍ

**“Həqiqətən, Allah heç bir özündən razını, özünü öyəni sevmir”** [Loğman surəsi, 18-ci ayə].

Peyğəmbər ﷺ demişdir: Uca Allah buyurur: “Qürur (əzəmət) mənim örtüyüm, təkəbbürlülük qiyafətimdir. Bu iki şeydə mənimlə rəqabət aparanı Cəhənnəm oduna ataram”.[1]

Peyğəmbər ﷺ demişdir: “Cənnətlə Cəhənnəm Allah qarşısında münaqişə etdilər. Cənnət dedi: Ey Rəbbim nə üçün mənə dəyərsiz və zəif insanlar daxil olurlar? Cəhənnəm isə belə dedi: Mənə isə böyüklənənlər və təkəbbürlülər?[2]

Uca Allah buyurur:

تِلْكَ ٱلدَّارُ ٱلْءَاخِرَةُ نَجْعَلُهَا لِلَّذِينَ لَا يُرِيدُونَ عُلُوًّا فِى ٱلْأَرْضِ وَلَا فَسَادًا

**“Biz o Axirət yurdunu yer üzündə təkəbbürlük etmək və fitnə-fəsad törətmək istəməyənlərə nəsib edirik”** [əl-Qasas surəsi, 83-cü ayə].

وَلَا تُصَعِّرْ خَدَّكَ لِلنَّاسِ وَلَا تَمْشِ فِى ٱلْأَرْضِ مَرَحًا إِنَّ ٱللَّهَ لَا يُحِبُّ كُلَّ مُخْتَالٍ فَخُورٍ

**“İnsanlardan təkəbbürlə üz çevirmə, yer üzündə özünü darta-darta gəzib dolanma. Həqiqətən, Allah heç**

---

[1] (Səhih) Muslim /2620/.

[2] (Səhih) əl-Buxari /4850/, Muslim /2846/.

**bir özündən razını, özünü öyəni sevmir”** [Loğman surəsi, 18-ci ayə].

Sələmə ibn Akva رضي الله عنه rəvayət edərək demişdir: Bir nəfər Peyğəmbərin ﷺ yanında sol əllə yeyirdi. Peyğəmbər ﷺ ona: “Sağ əlinlə ye”– dedi. Həmin şəxs təkəbbürlük edərək: Bacarmıram – dedi. Peyğəmbər ﷺ də: “Görüm heç bacarmayasan”– dedi. Həmin şəxs ondan sonra əlini ağzına qaldıra bilmədi.[1]

Peyğəmbər ﷺ demişdir: “Sizə Cəhənnəm əhlinin kim olduğu barədə xəbər verimmi? İnsanlardan şiddətli, kobud, böyük bədəni olub özünü bəyənərək gəzən təkəbbürlülər”.[2]

İbn Ömərdən رضي الله عنه rəvayət olunur ki, Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Gəzəndə lovğalanan və özünü bəyənən hər bir şəxs, Allah ona qarşı qəzəblənmiş halda Onunla görüşər”. [3]

Əbu Hüreyrədən رضي الله عنه isə belə bir səhih hədis rəvayət olunmuşdur: “Cəhənnəm oduna girəcək ilk üç şəxs: zalım hökmdar, zəkatını ödəməyən varlı və özünü bəyənən kasıb olacaqdır”.[4]

Kibrli şəxslərin ən pisi isə, öz elmi və fəziləti ilə təkəbbürlük edənlərdir. Bu cür insanlara onların elmlərinin faydası olmayacaq. Axirətini qazanmaq üçün elm alan şəxsin elmi onu təvazökar, qəlbini müti edər. Aldığı elm onu pusquya salar, onu başlı başına buraxmayaraq hər

---

[1] (Səhih) Muslim /2021/.

[2] (Səhih) əl-Buxari /4918/, Muslim /2853/.

[3] (Səhih) Əhməd 2/118, əl-Hakim 1/60.

[4] (Çox zəif) Əhməd 2/425, əl-Həkim 1/387.

vaxt nəfsini haqq-hesaba çəkər. Yox əgər diqqətsizlik edərsə, aldığı elm onu doğru yoldan azdıraraq həlak edər. Elmi lovğalanmaq, başçı olmaq, insanlara yuxarıdan aşağı baxmaq, onları abdal saymaq üçün alan şəxsin etdiyi əməl ən böyük təkəbbürlükdən sayılır. Qəlbində zərrə qədər təkəbbürlük olan şəxs Cənnətə girməyəcəkdir. Allahdan başqa qüvvət sahibi yoxdur.



# On altıncı böyük günah.
# Yalan yerə şahidlik etmək.

Uca Allah buyurur:

وَٱلَّذِينَ لَا يَشۡهَدُونَ ٱلزُّورَ

**“Onlar yalandan şahidlik etməz,..”** [əl-Furqan surəsi, 72-ci ayə].

Hədisdə isə deyilir: “Yalan yerə şəhadət, Allaha şərik qoşmağa bərabərdir”. [1]

Uca Allah buyurur:

فَٱجۡتَنِبُواْ ٱلرِّجۡسَ مِنَ ٱلۡأَوۡثَٰنِ وَٱجۡتَنِبُواْ قَوۡلَ ٱلزُّورِ

**“Elə isə murdar bütlərdən uzaq olun, yalan sözlərdən də çəkinin”** [əl-Həcc surəsi, 30-cu ayə]

Hədisdə isə deyilir: “Qiyamət günü yalan şəhadət verənlərə Cəhənnəm vacib olacaq”.[2]

Yalan yerə şahidlik edən şəxs çox böyük günahlar etmiş olur:

Birinci: Yalan danışır və iftira yaxır.

Uca Allah buyurur:

إِنَّ ٱللَّهَ لَا يَهۡدِي مَنۡ هُوَ مُسۡرِفٞ كَذَّابٞ

---

[1] (Həsən) ət-Tirmizi /2300-2301/, Əbu Davud /3599/.

[2] (Uydurma hədisdir) ibn Məcə /2373/, əl-Hakim 4/98.

**“Həqiqətən, Allah həddi aşanı, yalançını doğru yola yönəltməz”** [Ğafir surəsi, 28-ci ayə].

Hədisdə isə: “Mömin xəyanətlə yalançılıqdan başqa hər şeylə xarakterizə oluna bilər”.[1]

İkinci: Yalan şahidlik etdiyi şəxsə qarşı zülm etmiş olur. Belə ki, onun malının, namusunun və ruhunun götürülməsinə səbəb olur.

Üçüncü: Lehinə yalan şahidlik etdiyi şəxsə sahidliyi ilə, haram mal vermək və Cəhənnəmə getməsini vacib etməsi ilə zülm etmiş olur.

Peyğəmbər ﷺ demişdir: “Mən kimə haqsız olaraq qardaşının malından versəm götürməsin. Çünki o adama bir parça Cəhənnəm odu ayırmış oluram”.[2]

Dördüncü: O, Allahın haram buyurduğu əməli mübah etməklə onu malından, qanından və namusundan ayırmış olur.

Peyğəmbər ﷺ demişdir: “Müsəlmanın qanı, malı və namusu müsəlmana haramdır”.[3]

Peyğəmbər ﷺ demişdir: “Sizə ən böyük günahlar haqqında xəbər verimmi? Allaha şərik qoşmaq, valideynə qarşı itaətsizlik etmək və yalan söz və yalan yerə şahidlik etmək”. O bu sonuncunu o qədər təkrar etdi ki, biz: –kaş ki, susaydı– dedik.[4]

---

[1] (Zəif) Əhməd 5/252, ibn əbi Asim /114/.

[2] (Səhih) əl-Buxari /2457/, Muslim /1713/.

[3] (Səhih) Muslim /2564/.

[4] (Səhih) əl-Buxari /2654/, Muslim /87/ Hədis Əbu Bəkradan رضي الله عنه – dan rəvayət olunmuşdur.



# On yeddinci böyük günah. Homoseksuallıq.

Allah təala öz dəyərli kitabında bizlərə bir neçə məqamda Lut qövmünün hekayəsini, onları etdikləri çirkin əməllərinə görə həlak etdiyini bildirmişdir və bütün müsəlmanlar homoseksuallığın böyük günahlardan sayılmasına ittifaq etmişlər. Uca Allah buyurur:

أَتَأْتُونَ ٱلذُّكْرَانَ مِنَ ٱلْعَٰلَمِينَ ﴿١٦٥﴾

وَتَذَرُونَ مَا خَلَقَ لَكُمْ رَبُّكُم مِّنْ أَزْوَٰجِكُمۚ بَلْ أَنتُمْ قَوْمٌ عَادُونَ ﴿١٦٦﴾

**“Doğrudanmı siz insanlar içində ancaq kişilərlə yaxınlıq edir və Rəbbinizin sizin üçün yaratdığı qadınlarınızı tərk edirsiniz? Siz, həqiqətən də, həddi aşan adamlarsınız”** [əş-Şüəra surəsi, 165-166-cı ayələr].

Homoseksuallıq zinadan daha qəbahətli və daha iyrəncdir.

Peyğəmbər ﷺ demişdir: “Lut qövmünün etdiyi əməli edənə Allah lənət eləsin”.[1]

Həmçinin ﷺ demişdir: “Edəni də, ediləni də öldürün”.[2]

İbn Abbas رضي الله عنه demişdir: Bu əməli edən şəxs kənddəki ən hündür binanın üzərindən atılıb sonra daşqalaq edilməlidir.[3]

---

[1] (Səhih) Əhməd 1/309, əl-Hakim 4/356.

[2] (Səhih) ət-Tirmizi /1406/, Əbu Davud /4462/.

[3] (Səhih) əl-Beyhəqi 8/232, ibn Əbi Şeybə 9/529.

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur ki, "Qadınların öz aralarındakı lezbiyanlığı zinadır".[1]

Şafii məzhəbinə görə homoseksuallıq edənin cəzası zinanın cəzası ilə eynidir. Həmçinin köləsi ilə bu çirkin işi edən şəxsin homoseksual günahkar olduğuna ümmət ittifaq etmişdir.

[1] (Çox zəif) Əbu Yələ /7491/, ət-Təbərani 22/63.

## On səkkizinci böyük günah. İsmətli qadınları zinada ittiham etmək.

Uca Allah buyurur:

إِنَّ ٱلَّذِينَ يَرۡمُونَ ٱلۡمُحۡصَنَٰتِ ٱلۡغَٰفِلَٰتِ ٱلۡمُؤۡمِنَٰتِ لُعِنُواْ فِي ٱلدُّنۡيَا وَٱلۡأٓخِرَةِ وَلَهُمۡ عَذَابٌ عَظِيمٌ

**“*Murdar əməldən* xəbəri olmayan ismətli mömin qadınları *zinada* günahlandıranlar dünyada və axirətdə lənətə düçar olarlar. Onları böyük bir əzab gözləyir”** [ən-Nur surəsi, 23-cü ayə].

وَٱلَّذِينَ يَرۡمُونَ ٱلۡمُحۡصَنَٰتِ ثُمَّ لَمۡ يَأۡتُواْ بِأَرۡبَعَةِ شُهَدَآءَ فَٱجۡلِدُوهُمۡ ثَمَٰنِينَ جَلۡدَةً

**“İsmətli qadınları *zinada* günahlandırıb, sonra dörd şahid gətirməyən kəslərə səksən çubuq vurun...”** [ən-Nur surəsi, 4-cü ayə].

Peyğəmbər ﷺ demişdir: “(Sahibini) həlak edəcək yeddi böyük günahdan çəkinin!” Onlardan birinin də zinadan xəbəri olmayan namuslu, ismətli, mömin qadınları zinada ittiham etmək olduğunu bildirmişdir.[1]

---

[1] (Səhih) əl-Buxari /2766/, Muslim /89/ Hədis Əbu Hureyrədən رضي الله عنه rəvayət olunub.

Peyğəmbər ﷺ demişdir: "Müsəlman o kəsdir ki, digər müsəlmanlar onun əlindən və dilindən salamatdır".[1]

Peyğəmbər ﷺ Müaza رضي الله عنه belə demişdir: "Anan səni itirsin, məgər Qiyamət günü insanları üzü üstə Cəhənnəmə atan, onların dilləri deyilmi?"[2]

Uca Allah buyurur:

وَٱلَّذِينَ يُؤۡذُونَ ٱلۡمُؤۡمِنِينَ وَٱلۡمُؤۡمِنَٰتِ بِغَيۡرِ مَا ٱكۡتَسَبُواْ فَقَدِ ٱحۡتَمَلُواْ بُهۡتَٰنٗا وَإِثۡمٗا مُّبِينٗا

**"Mömin kişiləri və mömin qadınları etmədikləri bir işdən ötrü günahlandıranlar, sözsüz ki, öz üzərilərinə böhtanla bərabər açıq-aydın ağır bir yük götürmüşlər"** [əl-Əhzab surəsi, 58-ci ayə].

Peyğəmbər ﷺ demişdir: "Dediyi həqiqi olan hal istisna olmaqla, kölə qadını zinakarlıqda ittiham edən şəxs Qiyamət günü cəzalandırılar".[3]

Möminlərin anası Aişəni رضي الله عنها, səmadan onun paklığını bildirən ayələr nazil olduqdan sonra zina etməkdə ittiham edən şəxsə gəldikdə isə o kafirdir və Quranı yalanladığına görə öldürülməlidir.

---

[1] (Səhih) əl-Buxari /10/, Muslim /40/.

[2] (Səhih) ət-Tirmizi /2619/, ibn Məcə /3973/.

[3] (Səhih) əl-Buxari /6858/, Muslim /1660/.

# On doqquzuncu böyük günah. Qənimətə, Beytul Mala və zəkata xəyanət etmək.

Uca Allah buyurur:

وَمَا كَانَ لِنَبِيٍّ أَن يَغُلَّ ۚ وَمَن يَغْلُلْ يَأْتِ بِمَا غَلَّ يَوْمَ الْقِيَامَةِ ۚ

**"Peyğəmbərə əmanətə xəyanət etmək yaraşmaz. Əmanətə xəyanət edən kimsə Qiyamət günü xəyanət etdiyi şeylə gələr"** [Ali İmran surəsi, 161-ci ayə].

Əbu Humeyd əs-Səidi ﷺ rəvayət edir ki, "Bir dəfə Peyğəmbər ﷺ Əzd qəbiləsindən ibn Lutbiyyə adlanan bir kişini zəkat malını yığmaq üçün göndərir. Həmin şəxs gələndə deyir: Bunlar sizin, bunu isə mənə hədiyyə veriblər. Bu zaman Peyğəmbər ﷺ minbərə qalxıb Allaha həmd-səna etdikdən sonra dedi: "Mən birinizi bir işə göndərdiyimdə, o gəlib: bunlar sizin, bunu isə mənə hədiyyə veriblər"– deyir. Əgər doğrudan da belədirsə qoy o şəxs ata-anasının evində otursun görək ona hədiyyə gəlirmi? Allaha and olsun ki, haqsız olaraq bir şeyi götürən şəxs Qiyamət günü Allahın hüzuruna həmin şeylə gələcəkdir. Elə edin ki, sizlərdən heç birini böyürən dəvə, inək və ya mələyən qoyun daşıyan şəxs olaraq tanımayım". Sonra o əllərini qaldırıb: "Allahım, çatdırdımmı?"– dedi.[1]

[1] (Səhih) əl-Buxari /925/, Muslim /1832/.

Əbu Hureyrə رضي الله عنه rəvayət edir ki, bir dəfə Peyğəmbərlə ﷺ birgə Xeybərə getmişdik. Qənimət olaraq qızıl, gümüş yox, yemək, mal və libas əldə etmişdik. Sonra biz, Cüzam qəbiləsindən olan bir kişinin Peyğəmbərə ﷺ hədiyyə etdiyi kölə (qul) ilə birgə vadiyə getdik. Ora endiyimiz zaman Peyğəmbərin ﷺ köləsi miniyi sərbəst buraxmaq üçün ayağa qalxanda oxla vurularaq ölür. Biz: Necə də rahat şəhidlik nəsib oldu ona ey Allahın elçisi –dedik. O isə dedi: “Əsla yox! Muhəmmədin canı əlində olana and olsun ki, Xeybər günü qənimətlər bölünməmişdən öncə arasından götürdüyü örtüyü odla alovlanmaqdadır”. Əbu Hureyrə رضي الله عنه dedi: İnsanlar bunu eşitdikləri zaman qorxdular. Bu vaxt bir nəfər bir və ya iki ədəd ayaqqabının üst hissəsini gətirib gəldiyi zaman Peyğəmbər ﷺ: “Bunlar Cəhənnəmdən olan ayaqqabının üst hissələridir”– dedi.[1]

Amr ibn Şüeyb atasından, o da öz atasından Peyğəmbərin ﷺ, Əbu Bəkrin və Ömərin رضي الله عنهما Qənimətə, zəkata və ya Beytul mala xəyanət edən şəxsi döyüb, mallarını yandırdıqlarını rəvayət etmişdir.[2]

Abdullah ibn Amr رضي الله عنه rəvayət edir ki, Peyğəmbərin ﷺ səfər ləvazimatlarına baxan Kiruira adlanan bir kişi var idi. Günlərin bir günü həmin şəxs ölür. Peyğəmbər ﷺ: “O Cəhənnəmlikdir”– dediyində, ona baxmağa gedirlər və orada xəyanətlə əldə edilən bir əba görürlər.[3]

---

[1] (Səhih) əl-Buxari /4234/, Muslim /115/.

[2] (Zəif) Əbu Davud /2715/.

[3] (Səhih) əl-Buxari /3074/.

Bu mövzu ilə bağlı hədislər çoxdur. Onların bir qismi zülm babında gələcəkdir.

Zülmün özü üç qismdir:

**Birinci:** Başqasının malını haqsız olaraq yemək.

**İkinci:** İnsanları döyüb, vurub, sındırıb, yaralamaqla onlara zülm etmək.

**Üçüncü:** İnsanları söyüb, lənətləyib, təhqir edib, onlara iftira yaxmaqla zülm etmək.

Minada Peyğəmbər ﷺ insanlara xütbə verərkən demişdir: "Sizin bu şəhəriniz, bu ayınız, bu gününüz haram olduğu kimi, qanlarınız, mallarınız və namusunuz də bir-birinizə haramdır".[1]

Peyğəmbər ﷺ demişdir: "Allah təharətsiz namazı və xəyanət yolu ilə əldə edilən maldan verilən sədəqəni qəbul etməz".[2]

Zeyd ibn Xalid əl-Cuhəni رضي الله عنه rəvayət edir ki; Bir nəfər Xeybər döyüşündə mala xəyanət edir. Peyğəmbər ﷺ də onun namazını qılmaqdan imtina edərək: "yoldaşınız Allah yolunda əldə edilən mala xəyanət etmişdir". –dedi. Həmin adamın üst-başını axtardığımız zaman, üzərində qiyməti iki dirhəmə bərabər olan bir inci tapdıq.[3]

İmam Əhməd demişdir: Mala xəyanət edən və özünü öldürəndən başqa Peyğəmbərin ﷺ kiminsə namazını qılmaqdan imtina etməsini bilmirik.

[1] (Səhih) əl-Buxari /67/, Muslim /1679/.

[2] (Səhih) Muslim /224/.

[3] (Səhih) Əbu Davud /2710/, ən-Nəsai 4/64, ibn Məcə /2848/.



# İyirminci böyük günah. İnsanların mallarını haqsızlıqla əldə edərək, onlara zülm etmək.

Uca Allah buyurur:

وَلَا تَأْكُلُوٓا۟ أَمْوَٰلَكُم بَيْنَكُم بِٱلْبَٰطِلِ وَتُدْلُوا۟ بِهَآ إِلَى ٱلْحُكَّامِ لِتَأْكُلُوا۟ فَرِيقًا مِّنْ أَمْوَٰلِ ٱلنَّاسِ بِٱلْإِثْمِ وَأَنتُمْ تَعْلَمُونَ

**“Mallarınızı öz aranızda haqsızlıqla yeməyin və camaatın malının bir qismini bilə-bilə günah yolu ilə yeyəsiniz deyə hakimləri ələ almağa çalışmayın”** [əl-Bəqərə surəsi, 188-ci ayə].

إِنَّمَا ٱلسَّبِيلُ عَلَى ٱلَّذِينَ يَظْلِمُونَ ٱلنَّاسَ وَيَبْغُونَ فِى ٱلْأَرْضِ بِغَيْرِ ٱلْحَقِّ ۚ أُو۟لَٰٓئِكَ لَهُمْ عَذَابٌ أَلِيمٌ

**“Məzəmmət olunmağa ancaq insanlara zülm edənlər və yer üzündə haqsız yerə azğınlıq edənlər layiqdirlər. Məhz onlar üçün ağrılı-acılı əzab vardır”** [əş-Şura surəsi, 42-ci ayə].

وَٱلظَّٰلِمُونَ مَا لَهُم مِّن وَلِىٍّ وَلَا نَصِيرٍ

**“Zalımların isə nə bir himayəçisi olar, nə də bir yardımçısı”** [əş-Şura surəsi, 8-ci ayə].



Peyğəmbər ﷺ demişdir: “Bu dünyada edilən bir zülm zülmətlərə çevriləcək”.[1]

Həmçinin ﷺ demişdir: “Kim başqasına, onun bir qarış torpağını almaqla zülm edərsə, Allah Qiyamət günü o torpağı yeddi qat edib boynuna keçirər”.[2]

Uca Allah buyurur:

إِنَّ ٱللَّهَ لَا يَظۡلِمُ مِثۡقَالَ ذَرَّةٍۖ

**“Həqiqətən, Allah zərrə qədər də olsa zülm etməz...”** [ən-Nisa surəsi, 40-cı ayə].

Hədisdə isə deyilir: “Dəftərdə yazılan insanların bir-birinə etdiyi zülmdən Allah heç nəyi tərk etməz”.[3]

Peyğəmbər ﷺ demişdir: “Varlı adamın dində boşluq edib, işi sonraya buraxması zülmdür”.[4]

Yalan yerə and içərək başqasının haqqını mənimsəmək də ən böyük zülmlərdəndir”.

Peyğəmbər ﷺ demişdir: “Yalan yerə and içməklə bir müsəlmanın haqqını mənimsəyən şəxsə Allah Cəhənnəmi vacib (Cənnəti isə haram) edər”. Dedilər: “Ey Allahın rəsulu, hətta bəsit bir şey olsa beləmi? Dedi: “Misvak ağacından bir çubuq olsa belə”.[5]

Peyğəmbər ﷺ demişdir: “Biz bir kəsə bir iş həvalə etdikdə, o bir iynə miqdarında və ya ondan daha çox dəyəri

---

[1] (Səhih) əl-Buxari /2447/, Muslim /2579/.

[2] (Səhih) əl-Buxari /2453/, Muslim /1612/.

[3] (Zəif) Əhməd 6/240, əl-Hakim 4/575.

[4] (Səhih) əl-Buxari /2287/, Muslim /1564/.

[5] (Səhih) Muslim /137/.

olan bir şeyi gizlədərsə, Qiyamət günü xəyanət etdiyi şeylə gələr”.[1]

Peyğəmbər ﷺ (bir adam haqqında belə) demişdir: “Qənimətlər bölünməmişdən öncə arasından götürdüyü örtüyü odla alovlanmaqdadır”. Bir nəfər bir ayaqqabının üst hissəsini gətirib: Bu Cəhənnəmdən olan ayaqqabıdır”– dedi.[2]

Bir nəfər dedi ki, ey Allahın rəsulu, əgər mən səbr edərək, ixlasla, arxası düşmənə deyil üzü düşmənə qarşı vuruşaraq ölsəm, günahlarım silinərmi? Dedi: “Bəli, yalnız borcdan başqa”.[3]

Peyğəmbər ﷺ demişdir: “Bəzi insanlar haqsız olaraq Allahın malını istədikləri kimi xərcləyirlər. O kəslərə Qiyamət günü Cəhənnəm odu yetər”.[4]

Cabir رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ Kəb ibn Ucraya dedi: “Haqsız yeyilən maldan əmələ gələn ət Cənnətə girməz, ona Cəhənnəm odu yetər”.[5]

Əbu Bəkr رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Haramla qidalanan bədən Cənnətə girməz”.[6]

Eləcə də haqsız vergi yığanlar, yolkəsənlər, oğrular, aldadanlar xainlər, bir şeyi qəsbkarlıqla alıb, sonra bunu inkar edərək verməyənlər. Eybi olan bir şeyin eybini gizlədib satanlar, qumarbazlar və müştəriyə malı artıq qiymətlə satanlar da buna aiddir.

---

[1] (Səhih) Muslim /1833/.
[2] (Səhih) əl-Buxari /4234/, Muslim /115/.
[3] (Səhih) Muslim /1885/.
[4] (Səhih) əl-Buxari /3118/.
[5] (Səhih) Əhməd 3/321, əl-Hakim 4/422.
[6] (Zəif) Əbu Yələ /83-84/.



# İyirmi birinci böyük günah. Oğurluq etmək.

Uca Allah buyurur:

وَٱلسَّارِقُ وَٱلسَّارِقَةُ فَٱقْطَعُوٓاْ أَيْدِيَهُمَا جَزَآءًۢ بِمَا كَسَبَا نَكَٰلًا مِّنَ ٱللَّهِ

**“Etdikləri əməlin əvəzində Allahın cəzası olaraq oğru kişinin və oğru qadının əllərini kəsin!..”** [əl-Maidə surəsi, 38-ci ayə].

Peyğəmbər ﷺ demişdir: “Allah (bir yumurta) və ya bir kəndir oğurladığına görə əli kəsilən oğruya lənət eləsin”.[1]

Peyğəmbər ﷺ demişdir: “Hətta əgər Məhəmmədin qızı Fatimə oğurluq edərsə, onun əlini kəsərəm”.[2]

Peyğəmbər ﷺ demişdir: “Zina edən şəxs bu əməli etdiyi müddətdə mömin olmaz, oğurluq edən şəxs də bunu etdiyi müddətdə mömin olmaz, lakin tövbə qapıları açıqdır”.[3]

Sələmə ibn Qeys رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Şübhəsiz ki, ən böyük günahlar dörddür: Allaha şərik qoşmaq, Allahın haram buyurduğu haqsız yerə adam öldürmək, zina etmək və oğurluq etmək”.[4]

Oğrunun tövbəsi oğurladığı şeyi sahibinə qaytarmayınca ona fayda verməz. Əgər onun buna imkanı yoxdursa, malın sahibindən halallıq istəməlidir.

---

[1] (Səhih) əl-Buxari /6783/, Muslim /1687/

[2] (Səhih) əl-Buxari /3475/, Muslim /1688/.

[3] (Səhih) əl-Buxari /2475/, Muslim /57/.

[4] (Səhih) Əhməd 4/339.



# İyirmi ikinci böyük günah.
# Yol kəsmək.

Uca Allah buyurur:

إِنَّمَا جَزَٰٓؤُاْ ٱلَّذِينَ يُحَارِبُونَ ٱللَّهَ وَرَسُولَهُۥ وَيَسۡعَوۡنَ فِي ٱلۡأَرۡضِ
فَسَادًا أَن يُقَتَّلُوٓاْ أَوۡ يُصَلَّبُوٓاْ أَوۡ تُقَطَّعَ أَيۡدِيهِمۡ وَأَرۡجُلُهُم
مِّنۡ خِلَٰفٍ أَوۡ يُنفَوۡاْ مِنَ ٱلۡأَرۡضِۚ ذَٰلِكَ لَهُمۡ خِزۡيٞ فِي ٱلدُّنۡيَاۖ
وَلَهُمۡ فِي ٱلۡأٓخِرَةِ عَذَابٌ عَظِيمٌ

**“Allaha və Onun Elçisinə qarşı müharibə edənlərin və yer üzündə fitnə-fəsad törətməyə səy göstərənlərin cəzası ancaq öldürülmək və ya çarmıxa çəkilmək, ya əllərinin və ayaqlarının çarpazvari kəsilməsi, yaxud da yaşadıqları yerdən sürgün edilməkdir. Bu, onlar üçün dünyada bir rüsvayçılıqdır. Axirətdə isə onları böyük bir əzab gözləyir”** [əl-Maidə surəsi, 33-cü ayə].

Adicə yolda kimisə qorxutmaq böyük günahdır. Bəs onun malını əlindən almaq, onu yaralamaq, öldürmək və ya başqa böyük günahlar etmək necə?! Bu cür insanların da çoxları namazı tərk edib, qəsb etdikləri malı içkiyə və zinaya sərf edənlərdir.



# İyirmi üçüncü böyük günah. Sahibini günaha batıran *əl-ğəmus* andı.

Abdullah ibn Amr رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Böyük günahlar: Allaha şərik qoşmaq; valideynə itaətsizlik etmək, adam öldürmək və yalan yerə əl-ğamuş andı içməkdir”.[1]

*Əl-ğəmus* andı: qəsdən yalandan içilən anddır. Sahibini günaha (və ya Cəhənnəm oduna) batırdığına görə belə adlanmışdır.

Peyğəmbər ﷺ demişdir: “Bir nəfər: Allaha and olsun ki, Allah filankəsi bağışlamayacaq”– dedi. Uca Allah isə: “Kimdir mənim onu bağışlamayacağımı deyib, and içən? Artıq Mən onu bağışladım, sənin isə əməllərini puç etdim”.[2]

Peyğəmbər ﷺ demişdir: “Qiyamət günü Allah üç nəfəri danışdırmaz, onu təmizə çıxarmaz və onu ağrıverici əzaba düçar edər: paltarını isbal edən (topuqdan aşağı geyən), söz gəzdirən və yalandan and içərək malını xərcləyən”.[3]

İbn Ömərdən رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “Allahdan başqasına and içən küfr etmiş olur”. Başqa bir ləfzdə: “Şirk etmiş olur”.[4]

---

[1] (Səhih) əl-Buxari /6675/.

[2] (Səhih) Muslim /2621/.

[3] (Səhih) Muslim /106/.

[4] (Səhih) ət-Tirmizi /1535/, Əbu Davud /3251/.



Peyğəmbər ﷺ demişdir: "Kim bir müsəlmanın malını əldə etmək naminə yalan yerə and içərsə, Allah ona qarşı qəzəbli halda Onunla görüşər". Dedilər: Hətta kiçik bir şey olsa beləmi? Dedi: "Hətta misvak ağacının bir çubuğu olsa belə". [1]

Həmçinin Peyğəmbərin ﷺ minbərinin yanında, əsr namazından sonra yalan yerə and içənin günahının böyüklüyü barədə hədis səhihdir". [2]

Peyğəmbər ﷺ demişdir: "Kim Lata, Üzzaya and olsun demişdirsə, "lə iləhə illəllah" desin!"[3]

Ola bilsin ki İslamı yeni qəbul etmiş bəzi səhabələr xəta edərək belə dediklərinə görə "lə iləhə illəllah" deməyə əmr olunublar.

Peyğəmbər ﷺ demişdir: "Kim bu minbərin yanında hətta nəm misvaka görə yalandan and içərsə, Cəhənnəm ona vacib olar".[4]

---

[1] (Səhih) Muslim /137/.

[2] (Səhih) əl-Buxari /2672/, Muslim /108/

[3] (Səhih) əl-Buxari /4860/, Muslim /1647/.

[4] (Səhih) Əbu Davud /3246/, ibn Məcə /2326/.



# İyirmi dördüncü böyük günah. Danışdığının çoxunda yalançı olmaq.

Uca Allah buyurur:

إِنَّ ٱللَّهَ لَا يَهۡدِي مَنۡ هُوَ مُسۡرِفٞ كَذَّابٞ

**“Həqiqətən, Allah həddi aşanı, yalançını doğru yola yönəltməz”** [əl-Ğafir surəsi, 28-ci ayə].

قُتِلَ ٱلۡخَرَّٰصُونَ

**“Məhv olsun yalançılar!”** [əz-Zariyat surəsi, 10-cu ayə].

ثُمَّ نَبۡتَهِلۡ فَنَجۡعَل لَّعۡنَتَ ٱللَّهِ عَلَى ٱلۡكَٰذِبِينَ

**“...sonra isə dua edib yalançılara Allahın lənət etməsini diləyək”** [Ali-İmran surəsi, 61-ci ayə].

Peyğəmbər ﷺ demişdir: “Şübhəsiz ki, yalan insanı əxlaqsızlığa, əxlaqsızlıq isə Cəhənnəmə aparır. İnsan çoxlu yalan danışarsa, Allah qatında onun adı “yalançı” yazılar”.[1]

Peyğəmbər ﷺ demişdir: “Münafiqin üç əlaməti var: danışdığı zaman yalan danışar, vəd verdiyi zaman vədinə xilaf çıxar və əmanətə xəyanət edər”.[2]

[1] (Səhih) əl-Buxari /6094/, Muslim /2607/.
[2] (Səhih) əl-Buxari /33/, Muslim /59/.



Həmçinin demişdir: “Dörd xisləti özündə cəm edən şəxs xalis münafiqdir. Kimdə bu dörd xislətdən biri olarsa, onu tərk edənədək onda nifaq xislətlərindən biri olar: Əmanətə xəyanət etmək, danışdığı zaman aldatmaq, əhdi pozmaq və münaqişə etdiyi zaman haqqı danmaq”.[1]

Peyğəmbər ﷺ demişdir: “Kim özündən bir yuxu uydursa, (Qiyamət günü) ona iki arpa dənəsini bir-birinə calaşdırmaq buyrular, ancaq o, bu dənələri heç vaxt calaşdıra bilməz.[2]

Peyğəmbər ﷺ demişdir: “Şübhəsiz ki, ən böyük iftira, insanın görmədiyi bir şeyi gördüyünü iddia edərək gözlərinə yaxdığı iftiradır”.[3]

Səmura ibn Cundubun رضي الله عنه Peyğəmbərin ﷺ yuxusu haqqında rəvayət etdiyi hədisdə deyilir: “Ağzı, burnu və gözünün qafasına qədər, cırıldığını gördüyüm şəxs isə, evindən çıxıb, böyüklüyü üfüqlərə çatacaq dərəcədə yalan danışan kəs idi”.[4]

Peyğəmbərdən ﷺ rəvayət olunur ki, “Xəyanətlə yalandan başqa hər şey mömininin təbiətində ola bilər”.[5]

Peyğəmbər ﷺ demişdir: “Həqiqətən də göstərilən yerlərdə (sərgilərdə) yalan danışmaq qaçılmazdır”.[6]

Həmçinin ﷺ demişdir: “İnsanın hər eşitdiyi şeyi danışmağı ilə əldə etdiyi günah onun üçün yetər”.[1]

[1] (Səhih) əl-Buxari /34/, Muslim /58/.

[2] (Səhih) əl-Buxari /7042/.

[3] (Səhih) əl-Buxari /3509/.

[4] (Səhih) əl-Buxari /845/.

[5] (Zəif) Əhməd 5/252, ibn əbi Asim /114/.

[6] (Zəif) əl-Beyhəqi 10/199.



Həmçinin ﷺ demişdir: “Verilməyən bir şeylə qarnını doyduran şəxs iki saxta libas geyinmiş kimidir”.[2]

Eləcə də ﷺ demişdir: “Zənn etməkdən həzər edin, şübhəsiz ki, zənn ən yalan xürafatdır”.[3]

“Üç nəfəri Allah danışdırmaz...” hədisində isə Peyğəmbər ﷺ onlardan birinin yalançı olduğunu bəyan etmişdir”.[4]

---

[1] (Səhih) Muslim /5/.

[2] (Səhih) əl-Buxari /5219/, Muslim /2130/.

[3] (Səhih) əl-Buxari /5143/, Muslim /2563/.

[4] (Səhih) Muslim /107/.

# İyirmi beşinci böyük günah. Özünü qətlə yetirərək intihar etmək, bu da ən böyük günahlardandır.

Uca Allah buyurur:

وَلَا تَقْتُلُوٓاْ أَنفُسَكُمْۚ إِنَّ ٱللَّهَ كَانَ بِكُمْ رَحِيمًا ﴿٢٩﴾ وَمَن يَفْعَلْ ذَٰلِكَ عُدْوَٰنًا وَظُلْمًا فَسَوْفَ نُصْلِيهِ نَارًاۚ وَكَانَ ذَٰلِكَ عَلَى ٱللَّهِ يَسِيرًا ﴿٣٠﴾ إِن تَجْتَنِبُواْ كَبَآئِرَ مَا تُنْهَوْنَ عَنْهُ نُكَفِّرْ عَنكُمْ سَيِّـَٔاتِكُمْ وَنُدْخِلْكُم مُّدْخَلًا كَرِيمًا

**“...bir-birinizi məhv etməyin. Həqiqətən, Allah sizə qarşı rəhmlidir. Kim bu əməlləri düşmənçilik və zülm etməklə yerinə yetirərsə, Biz onu odda yandıracağıq – bu da Allah üçün asandır. Sizə qadağan olunmuş böyük günahlardan çəkinsəniz, Biz sizin təqsirlərinizdən keçər və sizi şərəfli bir keçidə – *Cənnətə* daxil edərik”** [ən-Nisa surəsi, 29-31-ci ayələr].

وَٱلَّذِينَ لَا يَدْعُونَ مَعَ ٱللَّهِ إِلَٰهًا ءَاخَرَ وَلَا يَقْتُلُونَ ٱلنَّفْسَ ٱلَّتِي حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلْحَقِّ وَلَا يَزْنُونَۚ

**“Onlar Allahla yanaşı başqa məbuda yalvarmaz, Allahın haram etdiyi cana haqsız yerə qıymaz və zina etməzlər”** [əl-Furqan surəsi, 68-ci ayə].



Cundub ibn Abdullah رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Sizdən öncəki qövmlərin birində, bir kişinin əli yaralı olduğundan, bu onu çox üzmüşdü. Axırda dözməyib bıçaqla əlini kəsir. Xeyli qan itirdikdən sonra o ölür. Uca Allah da deyir ki: "Qulum məni qabaqladığına görə mən də Cənnəti ona haram etdim".[1]

Əbu Hüreyrə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim bir dəmir parçası ilə özünü öldürərsə, Cəhənnəmdə həmin dəmiri əlində tutub qarnına soxan vəziyyətdə əbədi olaraq qalar; kim zəhər içərək özünü öldürərsə, Cəhənnəmdə əlində zəhəri tutub onu udum-udum içən vəziyyətdə orada əbədi qalar".[2]

Başqa səhih bir hədisdə isə yaralı bir şəxsin ağrılarına dözməyərək qılıncının ucu ilə özünü öldürən şəxsə Peyğəmbər ﷺ: "O Cəhənnəm əhlindəndir"– demişdir.[3]

Sabit ibn Dahhək رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Müsəlmana lənət etmək onu öldürmək kimidir və kim bir mömini küfrdə ittiham edərsə, onu öldürmüş kimi olur və kim özünü bir şeylə öldürərsə, Qiyamət günü Allah ona həmin şeylə əzab verər".[4]

---

[1] (Səhih) əl-Buxari /3463/, Muslim /113/.
[2] (Səhih) əl-Buxari /5778/, Muslim /109/.
[3] (Səhih) əl-Buxari /2898/, Muslim /111/.
[4] (Səhih) əl-Buxari /1363/, Muslim /110/.

# İyirmi altıncı böyük günah.
# Pis qazilik etmək.

Uca Allah buyurur:

وَمَن لَّمۡ يَحۡكُم بِمَآ أَنزَلَ ٱللَّهُ فَأُوْلَٰٓئِكَ هُمُ ٱلۡكَٰفِرُونَ

**“Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar kafirlərdir”** [əl-Maidə surəsi, 44-cü ayə].

أَفَحُكۡمَ ٱلۡجَٰهِلِيَّةِ يَبۡغُونَۚ

**“Onlar cahiliyyə *dövrünün* hökmünümü istəyirlər?”** [əl-Maidə surəsi, 50-ci ayə].

إِنَّ ٱلَّذِينَ يَكۡتُمُونَ مَآ أَنزَلۡنَا مِنَ ٱلۡبَيِّنَٰتِ وَٱلۡهُدَىٰ مِنۢ بَعۡدِ مَا بَيَّنَّٰهُ
لِلنَّاسِ فِي ٱلۡكِتَٰبِ أُوْلَٰٓئِكَ يَلۡعَنُهُمُ ٱللَّهُ وَيَلۡعَنُهُمُ ٱللَّٰعِنُونَ

**“Kitabda insanlara bəyan etdiyimiz açıq-aydın dəlilləri və doğru yol göstərən ayələri nazil etdikdən sonra onları gizli saxlayanlara həm Allah lənət edir, həm də lənət edə bilənlər lənət oxuyurlar!”** [əl-Bəqərə surəsi, 159-cu ayə].

Talhə ibn Ubeydullahdan ﵁ rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “Allah, Onun nazil etdiyi ilə hökm etməyən başçının namazını qəbul etməz”.[1]

---

[1] (Zəif) əl-Hakim 4-89.

Bureydənin ﷺ rəvayət etdiyi hədisdə isə, Peyğəmbər ﷺ demişdir: "Bir cür qazi Cənnətdə, iki cür qazi isə Cəhənnəmdə olacaqdır. Haqqı bilib onunla hökm verən qazi Cənnətdə, haqqı bilib bilərəkdən zülm edən qazi ilə elmi olmadan hökm verən qazi isə Cəhənnəmdədir".[1]

Bu təhdid, verdiyi hökmə Allah və Onun rəsulundan elmi və dəlili olmayan hər bir qaziyə aiddir.

İbn Bureydə öz atasından, Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Bir cür qazi Cənnətdə, iki cür qazi isə Cəhənnəmdə olacaqdır"– dedikdən sonra soruşdular: Axı elmi olmayanın nə günahı var? Dedi: "Onun günahı elmsiz ola-ola qazilik etməsidir".[2]

Məqal ibn Sinan ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim bu ümmətdə hər hansı bir məsuliyyət sahibi olub, ədalətli olmazsa, Allah onu Cəhənnəm oduna atar".[3]

Əbu Hureyrədən ﷺ rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar arasında qazi təyin olunan şəxs, bıçaqsız doğranmış şəxs kimidir".[4]

Lakin əgər hakim ictihad edib, düzgünlüyə uyğun olan dəlillə hökm verərək, Fiqh alimlərinin rəyi ilə hökm verməzsə, hətta onun verdiyi hökmün zəif olduğu bəlli olsa belə, əcr qazanmış olur.

Çünki Peyğəmbər ﷺ demişdir: Əgər bir hakim ictihad etdikdə onun ictihadı doğru olarsa, o iki əcr qazanır. Yox

---

[1] (Səhih) ət-Tirmizi /1322/, Əbu Davud /3573/.

[2] (Səhih) ət-Tirmizi /1322/, Əbu Davud /3573/.

[3] (Zəif) əl-Hakim 4/90.

[4] (Səhih) ət-Tirmizi /1325/, Əbu Davud /3571/.



əgər ictihad etdikdə onun ictihadı səhv olarsa, onda bir əcr qazanmış olur".[1]

Peyğəmbər ﷺ bu hədisdə ictihad edib hökm verənin əldə etdiyi əcri tərtib etmişdir. Lakin hökm verdiyi məsələdə kimisə təqlid edirsə, o zaman hədis ona şamil edilmir. Bununla bərabər qaziyə hirsli halda, xüsusi ilə əgər məhkəmədə qarşı tərəfə görə qəzəblənibsə onun hökm verməsi haramdır. Əgər qazidə elmin azlığı pis niyyət, pis əxlaq və təqvanın azlığı kimi sifətlər cəm olarsa, o xəsarət çəkənlərdən olar. Gərək o, Cəhənnəm odundan canını qurtarmaq üçün bu vəzifəni tərk etsin.

Abdullah ibn Ömərin رضي الله عنه rəvayət etdiyi hədisdə, Peyğəmbər ﷺ demişdir: "Rüşvət alanla rüşvət verənə Allahın lənəti olsun".[2]

---

[1] (Səhih) əl-Buxari /7352/, Muslim /1716/.

[2] (Səhih) ət-Tirmizi /1337/, Əbu Davud /3580/.

# İyirmi yeddinci böyük günah.
# Dəyyusluq.

Uca Allah buyurur:

ٱلزَّانِى لَا يَنكِحُ إِلَّا زَانِيَةً أَوْ مُشْرِكَةً وَٱلزَّانِيَةُ لَا يَنكِحُهَآ إِلَّا زَانٍ أَوْ مُشْرِكٌ ۚ
وَحُرِّمَ ذَٰلِكَ عَلَى ٱلْمُؤْمِنِينَ

**“Zinakar kişi ancaq zinakar və ya müşrik bir qadınla evlənə bilər. Zinakar qadın da yalnız zinakar və ya müşrik bir kişiyə ərə gedə bilər. Möminlərə isə bu, haram edilmişdir”** [ən-Nur surəsi, 3-cü ayə].

Abdullah ibn Ömərdən رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “Üç nəfər Cənnətə girməz: valideynin üzünə ağ olan, dəyyus (yəni ailəsinin qeyrətini çəkməyib, onların qayğısına qalmayan) və özlərini kişilərə bənzədən qadınlar”. Hədis səhihdir, lakin bəziləri hədisin Ömərdən رضي الله عنه rəvayət olunduğunu demişlər.[1]

Ailəsində pozğunçuluğun olduğunu zənn edib, onları sevdiyinə görə, və ya ona qaytarmağa gücü çatmadığı miqdarda ya borcu ya da çoxlu mehri olduğundan dolayı, və ya onların kiçik uşaqları olduğuna görə, zövcəsinin qaziyə şikayət edib uşaqlarının haqqını istəyəcəyindən, onun isə buna imkanı olmadığından verə bilməyəcəyindən qorxaraq

[1] (Səhih) ən-Nəsai 5/80-81, əl-Hakim 1/72, Əhməd 2/134.

bunlara göz yuman şəxs bilsin ki, qeyrəti olmayan şəxsdə heç bir xeyir yoxdur.



# İyirmi səkkizinci böyük günah. Qadınların özlərini kişilərə, kişilərin isə qadınlara bənzətməsi.

Uca Allah buyurur:

وَالَّذِينَ يَجْتَنِبُونَ كَبَائِرَ الْإِثْمِ وَالْفَوَاحِشَ

**“O kəslər üçün ki, böyük günahlardan və çirkin əməllərdən çəkinir,..”** [əş-Şura surəsi, 37-ci ayə.]

İbn Abbas ﷺ demişdir: “Allahın rəsulu ﷺ özlərini qadınlara bənzədən kişilərlə özlərini kişilərə bənzədən qadınlara lənət etmişdir”.[1]

Peyğəmbər ﷺ demişdir: “Allah özlərini kişilərə bənzədən qadınlara lənət eləsin”.[2]

Əbu Hureyrə ﷺ demişdir: “Allahın rəsulu ﷺ qadın libası geyinən kişilərlə, kişi libası geyən qadınları lənətləmişdir”.[3]

Həmçinin Peyğəmbər ﷺ demişdir: Cəhənnəmlik olacaq kimsələrdən iki sinif var ki, mən onları (bu dünyada) görmədim: (birinci) yanlarında inək quyruğuna bənzər qamçı olub, onunla insanları qamçılayan kimsə, (ikinci) geyinmiş çılpaq, yanlarını oynadan, forslanaraq gəzən, başları dəvələrin güvənlərinə bənzər olan qadınlar. Bunlar

---

[1] (Səhih) əl-Buxari /5886/.

[2] (Səhih) Əbu Davud /4099/.

[3] (Səhih) Əbu Davud /4098/, Əhməd 2/325.



Cənnətə girməz, hətta onun qoxusunu belə duymazlar. Halbuki Cənnətin iyi uzaq-uzaq məsafələrdən hiss olunur”.[1]

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “Kişilər qadınlara itaət edəcəkləri vaxt həlak olarlar”.[2]

Qadının lənətlənməsinə səbəb ola biləcək digər əməllərə: niqabın altından qızıl, mirvari və başqa bu kimi zinət əşyalarını biruzə vermək, müşk və ya ənbərlə ətirlənmək, rəngarəng paltar və müxtəlif dəbli əzik-üzük geyməsi kimi biabırçılıqlar da aiddir.

[1] (Səhih) Muslim /2128/.

[2] (Zəif) Əhməd 5/45, əl-Hakim 4/291.



# İyirmi doqquzuncu böyük günah. Muhəllil və muhəlləl ləhu*.

İbn Məsuddan رضي الله عنه rəvayət olunan səhih bir hədisdə Peyğəmbər ﷺ demişdir: “Allah *muhəllil* və *muhəlləl ləhuya* lənət eləsin”.[1]

Əlidən də رضي الله عنه Peyğəmbərin ﷺ bu cür dediyi rəvayət olunur. Lakin bəzi məzhəblərə görə bu caiz olduğuna görə, qadağan olmasından bixəbər olaraq kimsə bu əməli edərsə, yəqin ki, Allah onu bağışlayar.[2]

---

* Yəni üç dəfə boşanılmış qadınla, birinci ərinə yenidən halal olsun deyə, sonradan boşamaq niyyəti ilə evlənən kişi və bu cür ərə gedən qadın nəzərdə tutulur.

[1] (Səhih) ən-Nəsai 6/149, ət-Tirmizi /1120/.

[2] (Səhih) Əbu Davud /2076/, ət-Tirmizi /1119/.



# Otuzuncu böyük günah. Ölü heyvan, axar qan və ya donuz əti yemək.

Uca Allah buyurur:

قُل لَّآ أَجِدُ فِي مَآ أُوحِيَ إِلَيَّ مُحَرَّمًا عَلَىٰ طَاعِمٍ يَطۡعَمُهُۥٓ إِلَّآ أَن يَكُونَ مَيۡتَةً أَوۡ دَمًا مَّسۡفُوحًا أَوۡ لَحۡمَ خِنزِيرٍ فَإِنَّهُۥ رِجۡسٌ أَوۡ فِسۡقًا أُهِلَّ لِغَيۡرِ ٱللَّهِ بِهِۦۚ

**“De: “Mənə gələn vəhylər içərisində ölü heyvan, axar qan, murdar sayılan donuz əti və Allahdan başqasının adı ilə kəsilmiş murdar heyvanlardan başqa, hər hansı bir şəxsin yediyi yeməklər içərisində haram buyurulan bir şey görmürəm...”** [əl-Ənam surəsi, 145-ci ayə].

Zərurət olmadan bunlardan birini dadan şəxs sözsüz ki, günahkarlardan sayılır. Lakin mən hesab edirəm ki, müsəlman qəsdən donuz əti yeməz. Bəlkə də, bunu İslamdan çıxmış əl-Cəbəliyyə və ət-Təyaminə firqələrinə mənsub olanlar edərlər. Möminlərə gəldikdə isə, onların qəlbində donuz ətini dadmaq içki içməkdən daha pisdir.

Səhih bir hədisdə Peyğəmbər ﷺ demişdir: “Haqsız yeyilən maldan əmələ gələn ət Cənnətə girməz, Cəhənnəm odu ona yetər”.[1]

[1] (Səhih) əl-Buxari /3118/.

Müsəlmanlar nərd oynamağın haram olması məsələsində icmaya gəlmişlər. Buna dəlil olaraq aşağıdakı hədis kifayətdir:

Peyğəmbərin ﷺ belə dediyi sabitdir ki; “Nərd oynayan kəs, əlini donuzun ətinə və ya yağına batırmış kimidir”.[1]

Bundan da belə nəticəyə gəlmək olur ki, müsəlmanın əlini donuzun əti və ya yağına vurması nərd oynamaqdan daha böyük günahdır. Bəs onda o əti yeyib qanını içmək necə? Allah bizi bu cür əməllərdən qorusun.

[1] (Səhih) Muslim /2260/

# Otuz birinci böyük günah. Sidikdən təmizlənməmək, bu da nəsranilərin xüsusiyyətlərindəndir.

Uca Allah buyurur:

وَثِيَابَكَ فَطَهِّرْ

**“Geyimini təmiz saxla!”** [əl-Müddəssir surəsi, 4-cü ayə].

Bir dəfə Peyğəmbər ﷺ iki qəbrin yanından keçdiyi zaman belə dedi: “Onların hər ikisi əzab çəkirlər, onlara bu əzab çox böyük bir günaha görə verilmir. Birincisi sidikdən təmizlənmir, ikincisi isə söz gəzdirirdi”. əl-Buxari və Muslimin əksər rəvayətlərində bu hədis: “O özünü sidikdən qorumurdu” ləfzi ilədir.[1]

Ənəs رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Sidikdən təmizlənin, çünki qəbir əzabının əksəriyyətinin səbəbi budur”.[2]

Bədənini və libasını sidikdən təmizləməyənin namazı qəbul olunmur.

[1] (Səhih) əl-Buxari /216/, Muslim /292/.
[2] (Səhih) əl-Dərəqutni 1/127.

# Otuz ikinci böyük günah. İnsanların mallarının bir hissəsini zorla almaq.

Bu cür insanlara Uca Allahın aşağıdakı ayəsi şamil olunur:

إِنَّمَا ٱلسَّبِيلُ عَلَى ٱلَّذِينَ يَظۡلِمُونَ ٱلنَّاسَ وَيَبۡغُونَ فِي ٱلۡأَرۡضِ بِغَيۡرِ ٱلۡحَقِّۚ أُوْلَٰٓئِكَ لَهُمۡ عَذَابٌ أَلِيمٞ

**"Məzəmmət olunmağa ancaq insanlara zülm edənlər və yer üzündə haqsız yerə azğınlıq edənlər layiqdirlər. Məhz onlar üçün ağrılı-acılı əzab vardır"** [əş-Şura surəsi, 42-ci ayə].

Özünü daşqalaq edilməklə təmizləyən zinakar qadının hədisində Peyğəmbər ﷺ: "O elə bir tövbə etdi ki, əgər insanlardan zorla vergi, pul alan şəxs elə bir tövbə etsəydi bağışlanardı və ya ondan qəbul olunardı".[1]

İnsanlardan bu yolla zorakılıqla vergi, pul alan şəxs yolkəsənə bənzəyir. Hətta o oğrudan da pisdir. İnsanlarla sərt davranaraq və onlardan yeni-yeni vergilər tələb edənə gəldikdə isə, o insafla davranaraq vergi yazıb, onu əsgərlərdən, qocalardan və yer sahiblərindən alandan daha zülmkar sayılır. Bu cür haqsız vergiləri yazan, toplayan və gətirənlər haram yeməkdə və günahda həmşərikdilər.

[1] (Səhih) Muslim /1696/.



## Otuz üçüncü böyük günah. Riyakarlıq, bu da nifaqdandır.

Uca Allah buyurur:

وَإِذَا قَامُوٓاْ إِلَى ٱلصَّلَوٰةِ قَامُواْ كُسَالَىٰ يُرَآءُونَ ٱلنَّاسَ وَلَا يَذۡكُرُونَ ٱللَّهَ إِلَّا قَلِيلًا

**“Onlar namaza durarkən könülsüz qalxar, özlərini camaata göstərər və Allahı olduqca az yad edərlər”** [ən-Nisa surəsi, 142-ci ayə].

لَا تُبۡطِلُواْ صَدَقَٰتِكُم بِٱلۡمَنِّ وَٱلۡأَذَىٰ كَٱلَّذِي يُنفِقُ مَالَهُۥ رِئَآءَ ٱلنَّاسِ وَلَا يُؤۡمِنُ بِٱللَّهِ وَٱلۡيَوۡمِ ٱلۡأٓخِرِۖ

**“Sədəqələrinizi, özünü camaata göstərmək məqsədilə xərcləyən, Allaha və Axirət gününə inanmayan şəxs kimi minnət qoymaqla və əziyyət verməklə puç etməyin”** [əl-Bəqərə surəsi, 264-cü ayə].

Peyğəmbər ﷺ demişdir: “Qiyamət günü (üç sinif insan) hamıdan öncə mühakimə olunacaq. Şəhid Allahın hüzuruna gətiriləcək və Allah ona bəxş etdiyi nemətlər haqqında xəbər verib deyəcək: “Bu nemətlərin müqabilində nə etmisən?” O deyəcək: Sənin yolunda vuruşub



şəhid olmuşam. Allah da ona deyəcək ki, "Yalan deyirsən, sənə qəhrəmandır deyilsin deyə vuruşmusan və ona da nail olmusan". Sonra əmr olunacaq və o üzü üstə sürüklənib Cəhənnəmə atılacaq. Sonra elm öyrənmiş və onu insanlara öyrətmiş, çoxlu Quran oxumuş bir şəxs Allahın hüzuruna gətiriləcək və Allah ona bəxş etdiyi nemətlər haqqında xəbər verib deyəcək: "Bu nemətlərin müqabilində nə etmisən?" O deyəcək: Sənin yolunda elm öyrənib onu insanlara öyrətmişəm və Quran oxumuşam. Allah da ona deyəcək ki, "Yalan deyirsən, sənə "alimdir" deyilsin deyə elm öyrənmisən və sənə "qaridir" (gözəl Quran oxuyandır) deyilsin deyə Quran oxumusan və ona da nail olmusan". Sonra əmr olunacaq və üzü üstə sürüklənib Cəhənnəmə atılacaq. Sonra, Allah tərəfindən çoxlu var-dövlət verilmiş bir şəxs Onun hüzuruna gətiriləcək və Allah ona bəxş etdiyi nemətlər haqqında xəbər verib deyəcək: "Bu nemətlərin müqabilində nə etmisən?" O deyəcək: Var-dövlətimi Sənin yolunda, Sənin istədiyin yerlərə sərf etmişəm. Allah da ona deyəcək ki, "Yalan deyirsən, sənə "necə səxavətli insandır"– deyilsin deyə var-dövlətini sərf etmisən və ona da nail olmusan". Sonra əmr olunacaq və o üzü üstə sürüklənib Cəhənnəmə atılacaq".[1]

İbn Ömər ﵁ rəvayət edir ki, ona dedilər: Biz əmirlərimizin yanında olduğumuz zaman xaricdə danışdıqlarımızın əksi olan şeyləri onlara deyirik. İbn Ömər ﵁ dedi: "Biz bunu Peyğəmbərin ﷺ vaxtında nifaqdan sayırdıq".[2]

[1] (Səhih) Muslim /1905/.

[2] (Səhih) əl-Buxari /7178/.

Peyğəmbər ﷺ demişdir: “Hər kim etdiyini eşitdirərsə, Allah da o kəsi eşitdirər. Kim riyakarlıq edərsə, Allah da onun iç üzünü meydana çıxarar”.[1]

Muaz رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Riyakarlığın azı belə şirkdir”.[2]

[1] (Səhih) əl-Buxari /6499/, Muslim /2987/.

[2] (Zəif) ibn Məcə /3989/, əl-Hakim 3/270.



# Otuz dördüncü böyük günah. Xəyanət.

Uca Allah buyurur:

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تَخُونُواْ ٱللَّهَ وَٱلرَّسُولَ وَتَخُونُوٓاْ أَمَٰنَٰتِكُمۡ وَأَنتُمۡ تَعۡلَمُونَ

**"Ey iman gətirənlər! Allaha və Onun Elçisinə xəyanətkarlıq göstərməyin və bilə-bilə aranızdakı əmanətlərə də xəyanət etməyin"** [əl-Ənfal surəsi, 27-ci ayə].

وَأَنَّ ٱللَّهَ لَا يَهۡدِي كَيۡدَ ٱلۡخَآئِنِينَ

**"Allahın xainlərin hiylələrinə yol vermədiyini bilsin"** [Yusuf surəsi, 52-ci ayə].

Peyğəmbər ﷺ demişdir: "Əmanətə xəyanət edənin imanı, əhdi pozanın isə dini yoxdur".[1]

Həmçinin ﷺ demişdir: "Münafiqin əlamətləri üçdür: "Danışdığı zaman yalan söyləyər, vəd verdiyi zaman ona xilaf çıxar və əmanətə xəyanət edər".[2]

Ümumiyyətlə hər hansı bir işdə xainlik pis bir əməldir. Lakin bəzi xəyanətlər digərlərindən daha qəbahətlidir. Sənin özünə xəyanət edən, sənin yaxınlarına və malına xəyanət edib böyük günahlar edənlərlə eyni deyildir.

[1] (Səhih) Əhməd 3/135.
[2] (Səhih) əl-Buxari /33/, Muslim /59/.

# Otuz beşinci böyük günah. Dünya üçün elm öyrənmək və elmi gizlətmək.

Uca Allah buyurur:

إِنَّمَا يَخْشَى ٱللَّهَ مِنْ عِبَادِهِ ٱلْعُلَمَٰٓؤُاْ

**“Allahdan Öz qulları arasında ancaq alimlər qorxarlar”** [Fatir surəsi, 28-ci ayə].

إِنَّ ٱلَّذِينَ يَكْتُمُونَ مَآ أَنزَلْنَا مِنَ ٱلْبَيِّنَٰتِ وَٱلْهُدَىٰ مِنۢ بَعْدِ مَا بَيَّنَّٰهُ لِلنَّاسِ فِى ٱلْكِتَٰبِ ۙ أُو۟لَٰٓئِكَ يَلْعَنُهُمُ ٱللَّهُ وَيَلْعَنُهُمُ ٱللَّٰعِنُونَ

**“Kitabda insanlara bəyan etdiyimiz açıq-aydın dəlilləri və doğru yol göstərən ayələri nazil etdikdən sonra onları gizli saxlayanlara həm Allah lənət edir, həm də lənət edə bilənlər lənət oxuyurlar!”** [əl-Bəqərə surəsi, 159-cu ayə].

إِنَّ ٱلَّذِينَ يَكْتُمُونَ مَآ أَنزَلَ ٱللَّهُ مِنَ ٱلْكِتَٰبِ وَيَشْتَرُونَ بِهِۦ ثَمَنًا قَلِيلًا ۙ أُو۟لَٰٓئِكَ مَا يَأْكُلُونَ فِى بُطُونِهِمْ إِلَّا ٱلنَّارَ وَلَا يُكَلِّمُهُمُ ٱللَّهُ يَوْمَ ٱلْقِيَٰمَةِ وَلَا يُزَكِّيهِمْ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ



**“Şübhəsiz ki, Allahın nazil etdiyi kitabda olanları gizli saxlayanlar və bununla cüzi miqdarda *pul* əldə edənlər öz qarınlarına oddan başqa bir şey doldurmurlar. Qiyamət günü Allah onları danışdırmaz və onları təmizə çıxarmaz. Onlar üçün ağrılı-acılı bir əzab vardır“** [əl-Bəqərə, 174-cü ayə].

وَإِذْ أَخَذَ ٱللَّهُ مِيثَٰقَ ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ لَتُبَيِّنُنَّهُۥ لِلنَّاسِ وَلَا تَكْتُمُونَهُۥ
فَنَبَذُوهُ وَرَآءَ ظُهُورِهِمْ وَٱشْتَرَوْا۟ بِهِۦ ثَمَنًا قَلِيلًا ۖ فَبِئْسَ مَا يَشْتَرُونَ

**“O zaman Allah Kitab verilənlərlə əhd bağlayıb: “Siz o *Kitabı* mütləq insanlara aydınlaşdıracaqsınız və onu gizlətməyəcəksiniz!”– deyə buyurdu. Onlar isə bu əhdi qulaqardına vurub onu ucuz qiymətə satdılar. Onların bu alveri necə də pisdir!”** [Ali İmran surəsi, 187-ci ayə]

Peyğəmbər ﷺ demişdir: “Kim, yalnız Allah üçün öyrənilməsi gərək olan elmi dünyavi məqsədlərini əldə etmək üçün öyrənərsə, Qiyamət günü Cənnətin qoxusunu belə duymaz”.[1]

Əbu Hureyrənin رضي الله عنه rəvayət etdiyi hədisdə, Cəhənnəmə sürüklənən üç nəfərdən birinə: “sənə alimdir”– deyilsin deyə elm öyrənmisən və ona da nail olmusan”– deyilir.[2]

---

[1] (Səhih) Əbu Davud /3664/, ibn Məcə /252/.

[2] (Səhih) Muslim /1905/.

Cabirdən ﷺ rəvayət olunan hədisdə Peyğəmbər ﷺ demişdir: "Elmi alimlərlə rəqabət apararaq öyünmək, səfehlərlə münaqişə etmək və ya məclislərdə seçilmək üçün öyrənməyin. Kim belə edərsə, onun aqibəti Cəhənnəmdir, Cəhənnəm".[1]

Kəb ibn Məlikdən ﷺ rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: "Kim elmi alimlərlə rəqabət apararaq öyünmək, səfehlərlə münaqişə etmək və ya insanların qəlblərini ələ almaq üçün istəyərsə, onun yeri Cəhənnəm odudur".[2]

Digər bir ləfzdə isə: "Allah onu Cəhənnəm oduna daxil edər".

Peyğəmbər ﷺ demişdir: "Kim soruşulduğu zaman elmi gizlədərsə, qiyamət günü onun ağzına oddan bir dağ vurular".[3]

Abdullah ibn Amrdan ﷺ rəvayət olunan hədisdə Peyğəmbər ﷺ demişdir: "Kim elmi gizlədərsə, Allah qiyamət günü onun ağzına oddan bir dağ vurar".[4]

Peyğəmbər ﷺ demişdir: "Allahım mən faydasız elmdən sənə sığınıram".[5]

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: "Kim Allahdan qeyrisi üçün və ya Allahdan qeyrisini istəyərək elm öyrənərsə Cəhənnəmdəki kürsüsünü hazırlamış olar".[6]

---

[1] (Səhih) ibn Məcə /254/, əl-Hakim 1/86.
[2] (Həsən) ət-Tirmizi /2656/, əl-Hakim 1/86.
[3] (Səhih) ət-Timizi /2649/, Əbu Davud /3658/.
[4] (Səhih) əl-Hakim 1/102.
[5] (Səhih) Muslim /2722/.
[6] (Zəif) ət-Tirmizi /2657/, ibn Məcə /258/.

Eləcə də ibn Məsud رضي الله عنه demişdir: “Kim elm öyrənib ona əməl etməzsə, aldığı elm onun yalnız təkəbbürlüyünü artırar”.

Əbu Uməmə رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Qiyamət günü pis alim gətirilib Cəhənnəmə atılar. Dəyirman eşşəyi hərləndiyi kimi bağırsaqları da onun ətrafında fırlanar. Ona deyərlər: Sən nə səbəbdən bu vəziyyətə düşmüsən? Biz ki sənin sayəndə hidayətə varmışıq? O isə deyəcəkdir: Sizi çəkindirdiyim əməllərdə sizə müxalif olurdum”.[1]

[1] (Səhih) əl-Buxari /3267/, Muslim /2989/.

# Otuz altıncı böyük günah.
# Söz gəzdirmək.

Uca Allah buyurur:

لَا تُبْطِلُوا۟ صَدَقَـٰتِكُم بِٱلْمَنِّ وَٱلْأَذَىٰ كَٱلَّذِى يُنفِقُ مَالَهُۥ رِئَآءَ ٱلنَّاسِ وَلَا يُؤْمِنُ بِٱللَّهِ وَٱلْيَوْمِ ٱلْـَٔاخِرِ

**“Sədəqələrinizi, özünü camaata göstərmək məqsədilə xərcləyən, Allaha və Axirət gününə inanmayan şəxs kimi minnət qoymaqla və əziyyət verməklə puç etməyin”** [əl-Bəqərə surəsi, 264-cü ayə].

Səhih hədisdə isə, Peyğəmbər ﷺ: “Qiyamət günü Allah üç şəxsi danışdırmaz, onlara nəzər salmaz, onları təmizə çıxarmaz və onlara ağrıdıcı bir əzab verər: Paltarını isbal edərək geyən, söz gəzdirən və yalandan and içməklə malını sərf edən”. –deyə buyurmuşdur.[1]

Əbu Umamədən رضي الله عنه rəvayət olunan hədisdə Peyğəmbər ﷺ demişdir: “Allah üç şəxsdən nə mal sərf etmə, nə də ədalət qəbul etməz: Valideyninin üzünə ağ olan, söz gəzdirən və qədəri yalanlayan”.[2]

[1] (Səhih) Muslim /106/.

[2] (Həsən) ibn Əbi Asimin “Sünnə” əsəri /323/. ət-Təbəraninin “Böyük” kitabı /7547/.



# Otuz yeddinci böyük günah. Qədəri yalanlamaq.

Uca Allah buyurur:

إِنَّا كُلَّ شَيْءٍ خَلَقْنَٰهُ بِقَدَرٍ

**"Biz, həqiqətən də, hər şeyi qədərincə yaratdıq"** [əl-Qəmər surəsi, 49-cu ayə].

وَٱللَّهُ خَلَقَكُمْ وَمَا تَعْمَلُونَ

**"Axı sizi də, sizin düzəltdiklərinizi də Allah yaratmışdır"** [əs-Saffət surəsi, 96-cı ayə].

مَن يُضْلِلِ ٱللَّهُ فَلَا هَادِيَ لَهُۥ

**"Allah kimi azdırarsa, ona doğru yol göstərən olmaz"** [əl-Əraf surəsi, 186-cı ayə].

وَأَضَلَّهُ ٱللَّهُ عَلَىٰ عِلْمٍ

**"Allah *əzəli* elmi sayəsində onu azğınlığa saldı,.."** [əl-Casiyə surəsi, 23-cü ayə].

وَمَا تَشَآءُونَ إِلَّآ أَن يَشَآءَ ٱللَّهُ

**"Amma Allah istəməyincə, siz istəyə bilməzsiniz"** [əl-İnsan surəsi, 30-cu ayə].



فَأَلْهَمَهَا فُجُورَهَا وَتَقْوَاهَا

"ona günahları və *Allahdan* qorxmağı təlqin edənə" [əl-Şəms surəsi, 8-ci ayə]

Bu barədə dəlillər çoxdur.

Müaz ibn Cəbəl ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahın elçiləri göndərdiyi bütün ümmətlərdə Qədəriyyə və Murciələr olmuşdur. Allah Qədəriyyə və Mürciəyə yetmiş Peyğəmbərin diliylə lənət etmişdir".[1]

Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü Allah üç nəfəri danışdırmaz, onlara nəzər salmaz və onları təmizə çıxarmaz: qədəri yalanlayan, daima sərxoşluq edən və övladını danan şəxs".[2]

Hüzeyfədən ﷺ rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: "Hər bir ümmətin məcusiləri vardır, Mənim ümmətimin məcusiləri isə qədərin olmadığını iddia edənlərdir".[3]

Aişə ﷺ Peyğəmbərin belə dediyini rəvayət etmişdir: "Qədərilər mənim ümmətimin məcusiləridir. Sadaladığım bu hədislərin raviləri zəif olduqları üçün qeyri sabitdir.[4]

İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ümmətimdən iki qrup insanın İslamdan heç bir payı yoxdur: Qədəriyyə və Murciə".[5]

---

[1] (Zəif) ibn Əbi Asimin "əs-Sünnə" əsəri /325/.
[2] (Zəif) ibn Əbi Asimin "əs-Sünnə" əsəri /323/.
[3] (Zəif) Əbu Davud /4692/, Əhməd 5/406-407.
[4] (Zəif) ibn Əbi Asimin "əs-Sünnə" əsəri /331/.
[5] (Çox zəif) ət-Tirmizi /2150/, ibn Məcə /73/.

Əbu Hureyrə رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Qədər barəsində danışmaq ümmətimin ən pisləri üçün təxirə salınmışdır”.[1]

Hüzeyfə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər bir insanı və onun etdikləri əməlləri Allah yaratmışdır”.[2]

Cəbrayılın hədisində o Peyğəmbərdən ﷺ soruşur ki, Ey Allahın Rəsulu iman nədir? Peyğəmbər ﷺ: “Allahı, Onun mələklərinə, kitablarına, rəsullarına, ölümdən sonra diriliyə və qədərin yaxşısına və pisinə iman gətirməkdir”.[3]

Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Altı nəfəri mən, Allah və duaları qəbul olunan hər bir Peyğəmbər lənətləmişdir: Allahın qədərini yalanlayan, Allahın kitabına əlavə edən, zor gücünə hakimlik edən, Allahın haram buyurduqlarını halal edən, mənim əhli beytimdən Allahın haram buyurduqlarını halal edən və sünnətimi tərk edən şəxs”.[4]

Əbu Dərdə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Valideyninə qarşı asi olan, qədəri inkar edən və daima sərxoşluq edən şəxs Cənnətə girməz”.[5]

İbn Ömərdən رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “Qədəriyyə bu ümmətin məcusiləridir, onlardan biri xəstələndikdə onu ziyarət etməyin, ölərsə cənazəsinə qatılmayın”.[6]

---

[1] (Həsən) əl-Hakim 2/473, ibn Əbi Asim /350/.

[2] (Səhih) əl-Hakim 1/31, ibn Əbi Asim /357/.

[3] (Səhih) əl-Buxari /50/, Muslim /9/.

[4] (Zəif) ət-Tirmizi /2115/, əl-Hakim 1/36.

[5] (Həsən) Əhməd 6/441, ibn Məcə /3376/.

[6] (Həsən) Əbu Davud /4691/, Əhməd 2/86.

İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Ümmətimdən qədəri yalanlayan bir qövm olacaqdır".[1]

Bir dəfə ibn Ömərin ﷺ yanına bir nəfər gəlib dedi: Filankəs sənə salam göndərir. İbn Ömər dedi: Mənə onun yenilik etdiyi gəlib çatıb. Əgər doğrudan da belədirsə ona məndən salam vermə. Mən Allahın rəsulunun ﷺ belə dediyini eşitdim: "Bu ümmətdə yerə batma, pozulma və qədər əhlinin məsələsinə girişmək olacaqdır".[2]

Əli ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Dörd şeyə iman gətirməyən iman gətirmiş sayılmır: Allahdan başqa ibadət haqqına layiq məbudun olmaması və mənim Allahın elçisi olmağıma, ölümdən sonra dirilməyə və qədərə".[3]

Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Şübhəsiz ki, bu ümmətin məcusiləri Allahın qədərini təkzib edənlərdir. Əgər onlardan kimsə xəstələnərsə, onu ziyarət etməyin, ölərsə, cənazə namazını qılmayın, onlarla qarşılaşdığınız zaman onlara salam verməyin".[4]

Bu fəsildə ibn Əbi Asim başqa bir neçə hədis də gətirmişdir, lakin onlarda zəiflik var.

---

1 (Səhih) Əbu Davud /4613/, Əhməd 2/90.

2 (Həsən) ət-Tirmizi /2153/, ibn Məcə /4061/.

3 (Səhih) ət-Tirmizi /2146/, ibn Məcə /81/.

4 (Zəif) ibn Məcə /92/.



# Otuz səkkizinci böyük günah. İnsanların gizli söhbətlərinə qulaq asmaq.

Bəlkə də bu böyük günahlardan sayılmaya bilər. Uca Allah buyurur:

وَلَا تَجَسَّسُوا۟ وَلَا يَغْتَب بَّعْضُكُم بَعْضًا ۚ

**“Bir-birinizi güdməyin, bir-birinizin qeybətini qırmayın!”** [əl-Hucurat surəsi, 12-ci ayə]

Peyğəmbər ﷺ demişdir: “Kim bir camaatın söhbətinə onlar bunu istəmədiyi halda qulaq asarsa, Qiyamət günü onun qulaqlarına ərinmiş qurğuşun tökülər. Kim bir canlının şəklini çəkərsə, ona əzab verilər və o həmin surətə ruh üfürməyə mükəlləf olar. Bunu isə o edə bilməz”.[1]

---

[1] (Səhih) əl-Buxari /2225/, Muslim /2110/.



# Otuz doqquzuncu böyük günah. Çoxlu lənət etmək.

Peyğəmbər ﷺ demişdir: “Mömini lənətləmək onu öldürmək kimidir”.[1]

Həmçinin ﷺ demişdir: “Müsəlmanı söymək fasiqlik, onu öldürmək isə küfrdür”.[2]

Həmçinin ﷺ demişdir: “Qiyamət günü çoxlu lənət edənlər nə şəfaətçi, nə də şahid olmazlar”.[3]

Peyğəmbər ﷺ demişdir: “Sadiq bir insanın lənət etməsi gərəksizdir”.[4]

Həmçinin ﷺ demişdir: “Mömin olan kəs çoxlu tənə vurub pis sözlər danışan, çoxlu lənət edən, rəzil işlər görən və iyrənc deyildir”.[5]

Həmçinin ﷺ demişdir: “Əgər bir nəfər kimisə lənətləyərsə, onun lənəti göyə qalxar. Sonra göyün qapıları onun üzünə bağlanar. Daha sonra yerin də qapıları onun üzünə bağlanar. Sonra onun lənəti sağa-sola hərəkət edər. Əgər burada da özünə asanlıqla bir yer tapmazsa, o zaman lənət olunan şəxsə əgər o buna layiqdirsə qayıdar, o da buna layiq olamasa lənət edənin özünə qayıdar”.[6]

---

[1] (Səhih) əl-Buxari /1363/, Muslim /110/.
[2] (Səhih) əl-Buxari /6044/, Muslim /64/.
[3] (Səhih) Muslim /2598/.
[4] (Səhih) Muslim /2597/.
[5] (Səhih) ət-Tirmizi /1978/, Əhməd 1/405.
[6] (Həsən) Əbu Davud /4905/, Əhməd 1/408.



İmran رضي الله عنه rəvayət edir ki; Bir dəfə Peyğəmbər ﷺ səfərdə ikən dəvələrdən birinin üstündə oturan bir ənsari qadın hirslənib dəvəsini lənətlədi. Bunu eşidən Peyğəmbər ﷺ dedi: “O qadının üzərindəkiləri alıb özünü tərk edin, o lənətlənib”. İmran رضي الله عنه dedi: Hal-hazırda həmin qadına insanlar arasında gəzdiyi zaman mən ona baxıram. Heç kəs ona əhəmiyyət vermir.[1]

Əbu Hureyrə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Şübhəsiz ki, ən böyük riba, insanın müsəlman qardaşının namusuna dil uzadıb söyləməsidir”.[2]

[1] (Səhih) Muslim /2595/.
[2] (Səhih) Əbu Davud /4877/.

# Qırxıncı böyük günah.
# Öz əmirini tərk etmək və digərləri.

Uca Allah buyurur:

وَأَوۡفُواْ بِٱلۡعَهۡدِۖ إِنَّ ٱلۡعَهۡدَ كَانَ مَسۡـُٔولٗا

**“Əhdə vəfa edin. Çünki *hər kəs* əhd barəsində sorğu-sual olunacaqdır”** [əl-İsra surəsi, 34-cü ayə].

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ أَوۡفُواْ بِٱلۡعُقُودِۚ

**“Ey iman gətirənlər! Əhdlərinizi yerinə yetirin...”** [əl-Maidə surəsi, 1-ci ayə].

وَأَوۡفُواْ بِعَهۡدِ ٱللَّهِ إِذَا عَٰهَدتُّمۡ

**“Allahla bağladığınız əhdə sadiq olun;..”** [ən-Nəhl surəsi, 91-ci ayə].

Peyğəmbər ﷺ demişdir: “Dörd sifəti özündə cəm edən şəxs həqiqi münafiqdir: danışdığı zaman yalan danışmaq, əmanətə xəyanət etmək, əhdini pozmaq və mübahisə etdiyi zaman özündən çıxıb haqqı danmaq”.[1]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Qiyamət günü hər hansı bir şeyə qarşı vəfasızlıq edən şəxs üçün arxasında bir sancaq olacaq və deyiləcək ki, bu filankəsin vəfasızlığıdır”.

[1] (Səhih) əl-Buxari /34/, Muslim /58/.



Şübhəsiz ki, ən böyük vəfasızlıq əmirə qarşı olunan vəfasızlıqdır".[1]

Peyğəmbər ﷺ demişdir: "Uca Allah buyurur: Qiyamət günü Mən üç nəfərə müxalif olacağam: Mənim yolumda pul xərcləyib sonra bu əməli tərk edən, azad bir şəxsi qul adı ilə satıb pulunu yeyən və bir şəxsi işdən ötrü icarəyə götürüb, işinin tamamında onun haqqını verməyən şəxs".[2]

Peyğəmbər ﷺ demişdir: "Kim itaətdən əl çəkərsə Qiyamət günü Allahla heç bir hüccəti olmadan görüşər. Kim boynunda beyət olmadan ölərsə, cahiliyyə ölümü ilə ölmüş olar".[3]

Peyğəmbər ﷺ həmçinin demişdir: "Kim Cəhənnəmdən qurtulub Cənnətə girmək və əcəli çatdığı zaman Allaha və axirət gününə iman gətirənlərdən olmaq istəyirsə, yanlarına gedilməsini istəyən şəxslərin yanına gəlsin. Kim bir imamın əlini sıxıb, qəlbini ona bağlayıb beyət edərsə, bacardığı qədər ona itaət etsin. Əgər başqa birisi gəlib ona qarşı çıxarsa, onun boynunu vurun".[4]

Peyğəmbər ﷺ demişdir: "Mənə itaət edən Allaha itaət etmiş, Mənə qarşı ası olan Allaha qarşı asi olmuş olur. Eləcə də əmirə itaət edən mənə itaət etmiş, əmirə qarşı asi olan mənə qarşı asi olmuşdur".[5]

Peyğəmbər ﷺ həmçinin demişdir: "Kim öz əmirində xoşlamadığı bir şey görərsə, səbir etsin. Çünki sultandan

---

[1] (Səhih) əl-Buxari (3188), Muslim /1736/.
[2] (Səhih) əl-Buxari /2227/.
[3] (Səhih) Muslim /1851/.
[4] (Səhih) Muslim /1844/.
[5] (Səhih) əl-Buxari /2957/, Muslim /1835/.



bir qarış uzaqlaşıb ölən cahiliyyə ölümüylə dünyasını dəyişmiş olur".[1]

Peyğəmbər ﷺ həmçinin demişdir: "Kim camaatdan bir qarış miqdarında uzaqlaşarsa İslamın ipini boynundan çıxarmış olar".[2]

Axı bir kəsə beyət etdikdən sonra ona itaət etməkdən boyun qaçıraraq, beyəti pozub, qılıncı ilə ona qarşı vuruşub, ölənəcən onu tərk etməkdən böyük günah nə ola bilər?

Peyğəmbər ﷺ demişdir: "Bizə qarşı silah qaldıran bizdən deyildir".[3]

[1] (Səhih) əl-Buxari /7053/, Muslim /1849/.

[2] (Səhih) Əbu Davud /4758/, Əhməd 5/180.

[3] (Səhih) əl-Buxari /7070/, Muslim /100/.



# Qırx birinci böyük günah. Kahinə və ya münəccimə inanmaq.

Uca Allah buyurur:

وَلَا تَقۡفُ مَا لَيۡسَ لَكَ بِهِۦ عِلۡمٌۚ

**“Haqqında məlumatın olmadığı bir işin dalınca getmə”** [əl-İsra surəsi, 36-cı ayə].

إِنَّ بَعۡضَ ٱلظَّنِّ إِثۡمٌۖ

**“Çünki zənn edilənlərin bir qismi günahdır”** [əl-Hucurat surəsi, 12-ci ayə]

عَٰلِمُ ٱلۡغَيۡبِ فَلَا يُظۡهِرُ عَلَىٰ غَيۡبِهِۦٓ أَحَدًا ﴿٢٦﴾ إِلَّا مَنِ ٱرۡتَضَىٰ مِن رَّسُولٍ

**“O, qeybi Biləndir və Öz qeybini heç kəsə açmaz; razı qaldığı elçidən başqa…”** [əl-Cin surəsi, 26-27-ci ayələr].

Peyğəmbər ﷺ demişdir: “Kim falçının və ya kahinin yanına gəlib onun dediklərinə inanarsa, Muhəmmədə ﷺ nazil olana (Qurana) qarşı küfr eləmiş olur”.[1]

Peyğəmbər ﷺ aramsız yağış yağan gecənin səhəri demişdir ki, “Allah deyir: –Səhər qullarımdan bəziləri mömin, digərləri isə kafir oldular. –Allahın lütfü ilə yağmur yağdı deyənlər mömin, ulduzlara qarşı küfr etdilər.

[1] (Səhih) Əbu Davud /3904/ ət-Tirmizi /135/.

Filan qasırğaya görə yağmur yağdı deyənlər isə Mənə qarşı kafir olub, ulduzlara iman gətirmiş oldular". [1]

Peyğəmbər ﷺ həmçinin demişdir: "Kim falçının yanına gəlib Ondan bir şey soruşub, ona inanarsa qırx gün namazı qəbul olmaz".[2]

Peyğəmbər ﷺ demişdir: "Ulduzlardan bir bölüm elm öyrənən şəxs, bir qism sehr öyrənmiş olur".[3]

---

[1] (Səhih) əl-Buxari /847/, Muslim /71/.

[2] (Səhih) Muslim /2230/.

[3] (Səhih) Əbu Davud /3905/, ibn Məcə /3726/.



# Qırx ikinci böyük günah.
# Qadının özbaşınalıq etməsi.

Uca Allah buyurur:

وَٱلَّٰتِي تَخَافُونَ نُشُوزَهُنَّ فَعِظُوهُنَّ وَٱهۡجُرُوهُنَّ فِي ٱلۡمَضَاجِعِ
وَٱضۡرِبُوهُنَّۖ فَإِنۡ أَطَعۡنَكُمۡ فَلَا تَبۡغُواْ عَلَيۡهِنَّ سَبِيلًاۗ

**“Özbaşınalıq etmələrindən qorxduğunuz qadınlara nəsihət edin, yataqda onları tərk edin və onları döyün! Əgər sizə itaət etsələr, onlara** ***əziyyət vermək üçün başqa*** **yol axtarmayın”** [əl-Nisa surəsi, 34-cü ayə].

Peyğəmbər ﷺ demişdir: “Əgər kişi öz qadınını yatağa çağırdığı zaman gəlməzsə və bundan dolayı kişi ona qarşı qəzəbli olaraq gecələyərsə, səhərə qədər mələklər həmin qadına lənət yağdırar”.

Buxari və Muslimin “Səhih” əsərlərindəki digər ləfzdə belədir: “Əgər qadın ərinin yatağını tərk edərək gecələyib onun yanına gəlməyi rədd edərsə, əri ondan razı olana qədər səmada olan (Allah) ona qarşı qəzəbli olar”.[1]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Ərinin icazəsi olmadan ərinin hüzurunda qadının oruc tutması, eləcə də onun izni olmadan kiminsə onun evinə gəlməsinə izn verməsi halal deyil”.[2]

---

[1] (Səhih) əl-Buxari /5193/, Muslim /1436/.
[2] (Səhih) əl-Buxari /5195/, Muslim /1026/.

Peyğəmbər ﷺ eləcə də demişdir: “Əgər Allahdan başqa kiməsə səcdə etməyi əmr etsəydim qadınlara öz ərlərinə səcdə etməyi əmr edərdim”.[1]

Mihsanın رضي الله عنه bibisi öz ərini Peyğəmbərə ﷺ xatırlatdığı zaman o dedi: “Onunla etdiyin rəftara fikir ver – o sənin ya Cənnətin, ya da Cəhənnəmindir”.[2]

Abdullah ibn Amr رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Allah ərinə ehtiyacı ola-ola ona minnətdarlığını bildirməyən qadına nəzər salmaz”.[3]

Peyğəmbərin ﷺ belə dediyi də rəvayət olunur ki, “Kim ərinin evindən çıxarsa, qayıdana və ya tövbə edənə qədər mələklər ona lənət oxuyar”. Bu barədə hədislər çoxdur.[4]

---

[1] (Səhih) ət-Tirmizi /1159/, əl-Hakim 4/171-172.

[2] (Həsən) Əhməd 4/341, ən-Nəsai /8963/.

[3] (Səhih) əl-Hakim 2/190.

[4] (Zəif) Məcmə ət Zəvaid 4/313.

# Qırx üçüncü böyük günah. Qohumluq əlaqələrini kəsmək.

Uca Allah buyurur:

وَٱتَّقُواْ ٱللَّهَ ٱلَّذِى تَسَآءَلُونَ بِهِۦ وَٱلۡأَرۡحَامَۚ

**“Adı ilə bir-birinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin!”** [ən-Nisa surəsi, 1-ci ayə].

فَهَلۡ عَسَيۡتُمۡ إِن تَوَلَّيۡتُمۡ أَن تُفۡسِدُواْ فِى ٱلۡأَرۡضِ وَتُقَطِّعُوٓاْ أَرۡحَامَكُمۡ ﴿٢٢﴾
أُوْلَٰٓئِكَ ٱلَّذِينَ لَعَنَهُمُ ٱللَّهُ فَأَصَمَّهُمۡ وَأَعۡمَىٰٓ أَبۡصَٰرَهُمۡ

**“Əgər *haqdan* üz çevirsəniz, ola bilsin ki, yer üzündə fitnə-fəsad törədəsiniz və qohumluq əlaqələrini kəsəsiniz. Onlar Allahın lənətlədiyi, qulaqlarını kar və gözlərini kor etdiyi kimsələrdir”** [Muhəmməd surəsi, 22-23-cü ayələr].

Peyğəmbər ﷺ demişdir: “Qohumluq əlaqələrini kəsən Cənnətə girməz”.[1]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Allaha və axirət gününə iman gətirən şəxs qohumlarla əlaqə saxlasın”.[2]

O ﷺ həmçinin demişdir: “Allah yaradılışı yaradıb qurtardıqdan sonra qohumluq əlaqələri qalxıb dedi: Bu,

[1] (Səhih) əl-Buxari /5984/, Muslim /2556/.
[2] (Səhih) əl-Buxari /6138/, Muslim /47/.

qohumluq əlaqələrini kəsməkdən sənə sığınanın məqamıdır. Allah təala dedi: Bəli, Məgər razı olarsınızmı ki, sənin əlaqələrini quranla Mən əlaqələr qurum və sənin əlaqələrini kəsənlə Mən də əlaqələrimi kəsim? Dedi: Bəli razıyam”.[1]

Eləcə də Peyğəmbər ﷺ demişdir: “Kim ruzisinin bol olmasını və ömrünün uzanmasını istəyirsə qohumluq əlaqələrini möhkəmləndirsin”.[2]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Qohumluq əlaqələri ərşdən asılıdır. O deyir: Kim mənim əlaqələrimi qursa, Allah da onunla əlaqələr qurar. Kim də mənim əlaqələrimi kəssə Allah da onunla əlaqələri kəsər”. Başqa bir ləfzdə isə: “Allah təala buyurur: kim qohumluq əlaqələrini qursa, Mən də onunla əlaqələr quraram, qohumluq əlaqələrini kəsənlə isə Mən də əlaqələri kəsərəm”.[3]

Uca Allah buyurur:

وَٱلَّذِينَ يَنقُضُونَ عَهۡدَ ٱللَّهِ مِنۢ بَعۡدِ مِيثَٰقِهِۦ وَيَقۡطَعُونَ مَآ أَمَرَ ٱللَّهُ بِهِۦٓ
أَن يُوصَلَ وَيُفۡسِدُونَ فِي ٱلۡأَرۡضِ أُوْلَٰٓئِكَ لَهُمُ ٱللَّعۡنَةُ وَلَهُمۡ سُوٓءُ ٱلدَّارِ

**“Allahla əhd bağladıqdan sonra onu pozan, Allahın qovuşdurulmasını əmr etdiyi şeyləri kəsən və yer üzündə fitnə-fəsad törədənlərə gəlincə, onlar üçün lənət və pis yurd vardır”** [ər-Rəd surəsi, 25-ci ayə].

Əbu Hüreyrədən رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ buyurur: “Uca Allah buyurur: ər-Rəhman

---

[1] (Səhih) əl-Buxari /4830/, Muslim /2554/.

[2] (Səhih) əl-Buxari /5986/, Muslim /2557/.

[3] (Səhih) əl-Buxari /5989/, Muslim /2555/.



Mənəm, o isə qohumluq əlaqələridir. Onun əlaqələrini quranla Mən də əlaqə quraram, onun əlaqələrini kəsənlə Mən də əlaqələri kəsərəm".[1]

Bu hədisdə varlı ola-ola kasıb qohumlara qarşı rəhmliliyi kəsən, habelə sərtlik, diqqətsizlik və axmaqlıq ucbatından əlaqələri kəsən şəxslər nəzərdə tutulur.

Peyğəmbər ﷺ demişdir: "Qohumlarınızla heç olmasa onlara salam verməklə əlaqə qurun".[2]

[1] (Səhih) Əbu Davud /1694/, ət-Tirmizi /1908/.

[2] (Həsən) əl-Bəzzər /1877/.

# Qırx dördüncü böyük günah.
# Libaslara və ya divarlara şəkil çəkmək.

Peyğəmbər ﷺ demişdir: “Kim bir canlının şəklini çəkərsə, (Qiyamət günü) ona ruh üfürməyə mükəlləf olar. Bunu isə o edə bilməz”.[1]

Peyğəmbər ﷺ demişdir: “Qiyamət günü ən şiddətli əzab şəkil çəkənlərə veriləcək. Onlara deyiləcək: yaratdıqlarınızı dirildin”.[2]

Aişədən رضي الله عنها rəvayət olunur ki; Bir dəfə Peyğəmbər ﷺ səfərdən döndüyü vaxt mənim, evin bir hissəsini üzərində şəkillər olan nazik örtüklə örtmüş olduğumu gördü. Bu zaman onun üzünün rəngi dəyişdi və örtüyü dartıb çıxararaq dedi: “Allah yanında ən şiddətli əzab olunan şəxslər Allahın yaratdıqlarının bənzərlərinin şəkillərini çəkənlərdir”.[3]

“Sünən” əsərində isə “həsən” isnadla bu hədis variddir: “Cəhənnəm odundan boyun çıxıb deyəcək: Mən Allaha şərik qoşana, hər bir inadkar zorbaya və şəkil çəkənlər üçün vəkil təyin olunmuşam”.[4]

Peyğəmbər ﷺ demişdir: “Qiyamət günü bu şəkilləri çəkənlərə əzab veriləcək. Onlara: yaratdıqlarınızı dirildin! – deyiləcək”.[5]

[1] (Səhih) əl-Buxari /2225/, Muslim /2110/.
[2] (Səhih) əl-Buxari /5950/, Muslim /2109/.
[3] (Səhih) əl-Buxari /5954/, Muslim /2107/.
[4] (Səhih) ət-Tirmizi /2577/, Əhməd 2/336.
[5] (Səhih) əl-Buxari /5951/, Muslim /2108/.



İbn Abbas ﷺ rəvayət edir ki; Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Bütün şəkil çəkənlər Cəhənnəmlikdirlər. Çəkdikləri hər bir şəklə can veriləcək ki, Cəhənnəmdə ona əzab versin".[1]

Peyğəmbər ﷺ demişdir: "Uca Allah buyurur: Şəkil çəkməklə Mənim yaratdığıma bənzər şeylər yaradandan daha zalım kim ola bilər? Bacarırlarsa, qoy toxum, arpa və ya heç olmasa zərrə yaratsınlar.[2]

Bundan əlavə Peyğəmbərin ﷺ şəkil çəkənləri lənətlədiyi də səhihdir.[3]

---

[1] (Səhih) əl-Buxari /5963/, Muslim /2110/.

[2] (Səhih) əl-Buxari /5953/, Muslim /2111/.

[3] (Səhih) əl-Buxari /5347/.

# Qırx beşinci böyük günah.
# Söz gəzdirmək.

Uca Allah buyurur:

وَلَا تُطِعْ كُلَّ حَلَّافٍ مَّهِينٍ ﴿١٠﴾ هَمَّازٍ مَّشَّآءِۭ بِنَمِيمٍ ﴿١١﴾

**“İtaət etmə hər tez-tez and içənə, alçağa, qeybət edənə, dedi-qodu yayana”** [əl-Qələm surəsi, 10-11-ci ayələr].

Peyğəmbər ﷺ demişdir: “Söz gəzdirən Cənnətə girməz”.[1]

Bir dəfə Peyğəmbər ﷺ iki qəbrin yanından keçərkən dedi: “Bu iki qəbrin sahiblərinə əzab verilir və bunun səbəbi çox böyük şey deyildir. Birinci (insanlar arasında) söz gəzdirir, ikinci isə sidikdən özünü qorumurdu”.[2]

Peyğəmbər ﷺ həmçinin demişdir: “İnsanların ən pislərindən bunlara bir üz, o birilərinə isə başqa üzlə gedən ikiüzlülərdir”. Başqa bir ləfzdə isə: “İnsanların ən pisi ikiüzlülərdir”.[3]

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “Səhabələrim haqqında heç kim gəlib mənə heç nə deməsin. Mən onların yanına sağlam qəlblə getmək istəyirəm”.[4]

---

[1] (Səhih) əl-Buxari /6056/, Muslim /105/.

[2] (Səhih) əl-Buxari /216/, Muslim /292/.

[3] (Səhih) əl-Buxari /3353/, Muslim /2526/.

[4] (Zəif) Əbu Davud /4860/, ət-Tirmizi /3893/.



Kəb ﷺ demişdir: “Söz gəzdirməkdən çəkinin, çünki bunu edən qəbr əzabından rahatlanmayacaq”.[1]

Mənsur Mücahiddən ﷺ: “(Cəhənnəmə) odun daşıyan” (ayəsinin təfsirində) belə dediyini rəvayət etmişdir: “O qadın (insanlar arasında) söz gəzdirirdi”.[2]

[1] (Səhih) ibn Əbi əl-Dünyə “Əl-ğiybə va nəmimə” 136.

[2] (Səhih) əl-Buxari 8/957.



## Qırx altıncı böyük günah.
## Ölü üçün fəryad qoparıb özünü vurmaq.

Peyğəmbər ﷺ demişdir: “İki şey insanlar arasında küfrdür: insanların nəsəb və soylarına iftira yaxıb tənə etmək və meyitin üzərində şivən qoparmaq”.[1]

Muslimin rəvayət etdiyi səhih bir hədisdə isə deyilir: “(Meyitin üzərində) şivən qoparan tövbə etməzsə, Qiyamət günü ona zirehdən xəstəlik və ərinmiş misdən libas geyindirilər”.[2]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Yanaqlarına vurub, yaxalarını cırıb, cahiliyyət dövrünün dualarını edənlər bizdən deyil”.[3]

O ﷺ həmçinin demişdir: “Meyitin qəbrinin üzərində ah-nalə edildiyi müddətdə ona əzab verilir”.[4]

Peyğəmbər ﷺ şivən qoparan, saçını dibindən qırxdıran və paltarını cıran qadınlardan uzaq durmuşdur”.[5]

---

[1] (Səhih) Muslim /67/.

[2] (Səhih) Muslim /934/.

[3] (Səhih) əl-Buxari /1294/, Muslim /103/.

[4] (Səhih) əl-Buxari /1292/, Muslim /927/.

[5] (Səhih) əl-Buxari /1296/, Muslim /104/.

# Qırx yeddinci böyük günah.
# İnsanın soyuna (nəsəbinə) tənə etmək.

Bu əməlin küfr olması labüddür.

Peyğəmbər ﷺ demişdir: “İnsanlar arasında iki şey küfr sayılır: İnsanların nəsəb və soylarına tənə etmək və meyidin üzərində şivən qoparmaq”.[1]

[1] (Səhih) Muslim /67/.



## Qırx səkkizinci böyük günah.
## Haqsızlıq və zülm etmək.

Uca Allah buyurur:

إِنَّمَا ٱلسَّبِيلُ عَلَى ٱلَّذِينَ يَظْلِمُونَ ٱلنَّاسَ وَيَبْغُونَ فِى ٱلْأَرْضِ بِغَيْرِ ٱلْحَقِّ ۚ
أُو۟لَٰٓئِكَ لَهُمْ عَذَابٌ أَلِيمٌ

**“Məzəmmət olunmağa ancaq insanlara zülm edənlər və yer üzündə haqsız yerə azğınlıq edənlər layiqdirlər. Məhz onlar üçün ağrılı-acılı əzab vardır”** [əl-Şura surəsi, 42-ci ayə].

Peyğəmbər ﷺ demişdir: “Allah mənə: təvazökar olun, bir-birinizə qarşı nə haqsızlıq, nə də lovğalıq etməyin – deyə vəhy etdi”.[1]

İbn Abbasın رضي الله عنه belə dediyi rəvayət olunur: “Əgər iki dağdan biri o birinə qarşı haqsızlıq etsəydi, Allah haqsızlıq edəni darmadağın edərdi”[2]

Peyğəmbər ﷺ demişdir: “Sahibinə axirət üçün hazırladığı əzabla bərabər dünyada da Allahın əzab verməsinə ən layiqli günah haqsızlıq etmək və qohumluq əlaqələrini kəsməkdir”.[3]

---

[1] (Səhih) Muslim /2865/.
[2] (Səhih) əl-Buxari /588/.
[3] (Səhih) Əbu Davud /4903/, ət-Tirmizi /2513/, ibn Məcə /4211/.



İbn Məsud ﷺ demişdir: Məlik ər-Rahavi dedi: Ey Allahın rəsulu, gördüyün kimi mənə belə bir gözəllik verilib. Mən də, istəyirəm ki, heç kim bunda məni azacıq belə üstələməsin, bu haqsızlıqdırmı? Dedi: "Bu haqsızlıq deyil, haqsızlıq haqqı danmaq və ya haqqa qarşı rəzillik etmək və insanları özündən aşağı görməkdir".[1]

Allah təala Qarunu haqsızlıq və inadkarlığı ucbatından yerə batırmışdır.

Peyğəmbər ﷺ demişdir: "Bir qadın bir pişiyi nə özü yedirtməyib, nə də onu yerin həşəratlarından yeməyə qoymayaraq ölənə qədər həbs etdiyi üçün Cəhənnəmə daxil oldu".[2]

İbn Ömər ﷺ demişdir: "Peyğəmbər ﷺ ruhu olan bir canlını hədəfə alıb, ona əzab verib, onu öldürən şəxsə lənət etmişdir".[3]

Əbu Məsud ﷺ demişdir: "Bir dəfə mən öz ixtiyarımda olan yeniyetmə oğlanı qamçı ilə vururdum. Birdən arxadan "Agah ol, ey Əbu Məsud!"– deyə bir səs eşitdim. Hirsli olduğumdan səsi anlamadım. Mənə yaxınlaşdıqda gördüm ki, o Peyğəmbərdir ﷺ. O mənə dedi: "Şübhəsiz ki, Uca Allah sənin üzərinə, sənin bu kölə üzərinə olan qüdrətindən daha Qadirdir" Dedim: Bundan sonra mülkümdə olan heç kəsi vurmayacağam". Digər bir ləfzdə: "Onun heybətindən çomaq əlimdən düşdü". Başqa bir rəvayətdə isə: Dedim: Ey Allahın Rəsulu, Allah yolunda onu azad

---

[1] (Səhih) əl-Hakim 4/182.
[2] (Səhih) əl-buxari /2365/, Muslim /2242/.
[3] (Səhih) əl-Buxari /5515/, Muslim /1958/.

edirəm. Dedi: “Əgər sən bunu etməsəydin səni cəhənnəm odu yandırıb yaxacaqdı”.[1]

Peyğəmbər ﷺ həmçinin demişdir: “İnsanlara dünyada əzab verənlərə Allah əzab verər”.[2]

Bir dəfə Peyğəmbər ﷺ üzünə damğa vurulmuş bir uzunqulağın yanından keçərkən belə demişdir: “Allah bunu damğalayana lənət eləsin”.[3]

O ﷺ həmçinin demişdir: “Kim bir şəxsi haqsız yerə qəsdən öldürərsə, Cənnətin qoxusunu duymaz. Halbuki onun qoxusu beş yüz illik məsafədən hiss olunur”.[4]

---

[1] (Səhih) Muslim /1659/.

[2] (Səhih) Muslim /2613/.

[3] (Səhih) Muslim /2117/.

[4] (Səhih) əl-Hakim 1/44.



# Qırx doqquzuncu böyük günah. İxtiyar sahibinə qarşı silahlı çıxış və böyük günaha görə təkfir etmək.

Uca Allah buyurur:

وَلَا تَعۡتَدُوٓاْۚ إِنَّ ٱللَّهَ لَا يُحِبُّ ٱلۡمُعۡتَدِينَ

**“həddi aşmayın! Həqiqətən, Allah həddi aşanları sevmir!”** [əl-Bəqərə surəsi, 190-cı ayə]

وَمَن يَعۡصِ ٱللَّهَ وَرَسُولَهُۥ فَقَدۡ ضَلَّ ضَلَٰلٗا مُّبِينٗا

**“Allaha və Onun Elçisinə asi olan kəs, əlbəttə ki, açıq-aydın azğınlığa düşmüşdür”** [əl-Əhzab surəsi, 36-cı ayə].

Peyğəmbər ﷺ demişdir: “Kim bir qardaşına: ey kafir – deyərsə, bu söz onlardan birinə qayıdar”.[1]

Ümumiyyətlə, xavariclərin vəsfləri haqda bir çox hədis və əsərlər vardır. Lakin onların kafir olub olmamasında ixtilaf etmişlər. Çünki:

Peyğəmbər ﷺ onlar barəsində belə demişdir: “Ox öz yayından çıxdığı kimi onlar da dindən çıxacaqlar. Onları harda görsəniz öldürün”.[2]

---

[1] (Səhih) əl-Buxari /6104/, Muslim /60/.

[2] (Səhih) əl-Buxari /5057/, Muslim /1066/.

Həmçinin ﷺ onlar barəsində demişdir: “Onlar yer üzərindəki ən pis qatillər, onları öldürənlər isə ən xeyirlilərdir”.[1]

Xavariclər bidət əhlidir. Onlar müsəlmanların qanlarını halal etmiş və onları, o cümlədən Osmanı, Əlini رضي الله عنه və bir çox böyük səhabələri təkfir etmişlər.

İbn Əbi Əufədən رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ belə dediyini eşitdim: “Xavariclər Cəhənnəmin köpəkləridir”.[2]

Səid ibn Cumhən رضي الله عنه rəvayət edir ki, Bir dəfə ibn Əbi Əufənin yanına daxil oldum. O kor idi. O məndən soruşdu: Sən kimsən? Dedim ki, Mən Səid ibn Cumhənəm. Dedi: Atan nə etdi? Dedim ki; Əzəriqalar onu qətlə yetirdilər. Dedi: Allah Əzəriqalara lənət eləsin. Allah Əzəriqaları öldürsün. Sonra o dedi: Peyğəmbər ﷺ bizə onların Cəhənnəmin köpəkləri olduqlarını demişdir. Mən soruşdum: Təkcə Əzəriqalarmı? Dedi: Bütün xavariclər.[3]

Abdullah ibn Əbi Əufə رضي الله عنه xavariclərə qarşı vuruşduğu zaman belə demişdir: Onları öldürənlərə və ya bu yolda ölənlərə Tuba (Cənnət) olsun.[4]

---

[1] (Həsən) ət-Tirmizi /3003/, ibn Məcə /176/, Əhməd 5/253.

[2] (Səhih) Əhməd 4/355, ibn Məcə /174/, əl-Albaninin “Səhih əl-Cəmi” əsəri /3347/.

[3] (Həsən) Əhməd 4/382, ibn Əbi Asimin “əl-Sünnə” əsəri /905/.

[4] (Həsən) Əhməd 4/382, ibn Əbi Asimin “əl-Sünnə” əsəri /906/ Şeyx əl-Albani bu hədisin Həsən olduğunu demişdir.



## Əllinci böyük günah. Müsəlmanlara əziyyət verib, onları söymək.

Uca Allah buyurur:

وَٱلَّذِينَ يُؤْذُونَ ٱلْمُؤْمِنِينَ وَٱلْمُؤْمِنَٰتِ بِغَيْرِ مَا ٱكْتَسَبُوا۟
فَقَدِ ٱحْتَمَلُوا۟ بُهْتَٰنًا وَإِثْمًا مُّبِينًا

**“Mömin kişiləri və mömin qadınları etmədikləri bir işdən ötrü günahlandıranlar, sözsüz ki, öz üzərilərinə böhtanla bərabər açıq-aydın ağır bir yük götürmüşlər”** [əl-Əhzab surəsi, 58-ci ayə].

وَلَا تَجَسَّسُوا۟ وَلَا يَغْتَب بَّعْضُكُم بَعْضًا

**“Bir-birinizi güdməyin, bir-birinizin qeybətini qırmayın...”** [əl-Hucurat surəsi, 12-ci ayə].

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا يَسْخَرْ قَوْمٌ مِّن قَوْمٍ عَسَىٰٓ أَن يَكُونُوا۟ خَيْرًا مِّنْهُمْ

**“Ey iman gətirənlər! Bir camaat digərini məsxərəyə qoymasın. Ola bilər ki, bunlar onlardan daha yaxşı olsunlar...”** [əl-Hucurat surəsi, 11-ci ayə]



وَيۡلٞ لِّكُلِّ هُمَزَةٖ لُّمَزَةٍ

**"Hər bir qeybət edənin, tənə vuranın vay halına!"** [əl-Huməzə surəsi, 1-ci ayə].

Peyğəmbər ﷺ demişdir: "Allah qatında insanların ən pisi, pisliyindən qorxub insanların onu tərk etdiyi kəsdir".[1]

Peyğəmbər ﷺ həmçinin demişdir: "Ey Allahın qulları. Şübhəsiz ki, Allah haramı qoymuşdur. Qardaşının namusuna qeybət etməklə toxunan, harama düşüb həlak olar".[2]

O ﷺ eləcə də demişdir: "Müsəlmanın namusu, malı və qanı hər bir müsəlmana haramdır, təqba (bax) burdadır. Müsəlmana etdiyi pis əməllərdən, müsəlman qardaşını alçaltmasının günahı yetər".[3]

O ﷺ həmçinin demişdir: "Müsəlman müsəlmanın qardaşıdır, ona zülm etməz, onu tərk etməz, onu alçaltmaz. Müsəlmana etdiyi pis əməllərdən müsəlman qardaşını alçaltmasının günahı yetər".[4]

Peyğəmbər ﷺ demişdir: "Müsəlmanı söymək fasiqlik, onu öldürmək isə küfrdür".[5]

Peyğəmbər ﷺ demişdir: "Qonşusu onun əziyyətindən narahat olan şəxs Cənnətə girməz". Bu Muslimin rəvayət etdiyi ləfzdir. Başqa bir səhih ləfzdə isə Peyğəmbər ﷺ demişdir: "Allaha and olsun ki, iman gətirməyib, Allaha and olsun ki, iman gətirməyib". Dedilər: Ey Allahın rəsulu

[1] (Səhih) əl-Buxari /6032/, Muslim /2591/.

[2] (Səhih) Əbu Davud /2015/, ibn Məcə /3436/.

[3] (Səhih) Muslim /2564/.

[4] Əvvəlki mənbə.

[5] (Səhih) əl-Buxari /6044/, Muslim /64/.



kimi nəzərdə tutursan? Dedi: “Qonşusu onun pisliyindən rahatsız olan kimsə”.[1]

əl-Buxari və Muslimin şərtlərinə müvafiq olan digər bir ləfzdə: “Qonşusu onun əziyyətindən rahatsız olan qul, Cənnətə girməz”.[2]

Peyğəmbər ﷺ demişdir: “Allaha və axirət gününə iman gətirən kəs qonşusuna yaxşılıq etsin”.[3]

Əbu Hureyrədən رضي الله عنه rəvayət olunur ki; Bir dəfə Peyğəmbərə ﷺ dedilər: Ey Allahın rəsulu, filan qadın gecələr namaz qılıb, gündüzlər oruc tutur, ancaq dili ilə qonşularına əziyyət verir, arsızdır (dili sərtdir). Peyğəmbər ﷺ dedi: “Onda xeyir yoxdur və o Cəhənnəmlikdir”.[4]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Ölülərinizin etdikləri yaxşılıqları xatırlayın. Onların pisliklərini xatırlamaqdan çəkinin”.[5]

Əbu Zərr رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Kim bir nəfəri: ey kafir və ya ey Allahın düşməni– deyə çağırarsa, əgər elə deyilsə, onun özünə qayıdar”.[6]

Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Meraca getdiyim zaman mis dırnaqlarıyla öz üzlərini və sinələrini cıran bir qövmlə rastlaşdıq. “Bunlar kimdir ey

---

[1] (Səhih) Muslim /46/.
[2] (Səhih) Əhməd 3/154, əl-Hakim 1/11.
[3] (Səhih) əl-Buxari /6138/, Muslim /47/.
[4] (Səhih) Əhməd 2/440, əl-Hakim 4/166.
[5] (Zəif) Əbu Davud /4900/, ət-Tirmizi /1019/, əl-Hakim 1/358.
[6] (Səhih) əl-Buxari /6045/, Muslim /61/.



Cəbrayıl?" deyə soruşdum. Dedi: –Bunlar insanların şərəflərinə toxunub onların ətlərini yeyənlərdir".[1]

Peyğəmbər ﷺ demişdir: "Şübhəsiz ki, ən böyük günahlardan biri insanın öz valideynlərini söyməsidir". Dedilər: Ey Allahın rəsulu, heç insan da öz valideynlərini söyərmi? Dedi: "Birinin ata və anasını söyür, o da bunun ata və anasını söyür".[2]

Digər bir ləfzdə: "Şübhəsiz ki, ən böyük günahlardan biri insanın öz valideynlərini lənətləməsidir". Dedilər: Ey Allahın rəsulu, insan öz valideynlərini necə lənətləyə bilər? Dedi: "Birinin ata və anasını söyür, o da bunun ata və anasını söyür".

Peyğəmbər ﷺ həmçinin demişdir: "Əgər biri kiməsə fasiq və ya kafir deyərsə, əgər o elə deyilsə, onun özünə qayıdar".[3]

O ﷺ eləcə də demişdir: "Ölüləri söyməyin, artıq onlar etdikləri əməllər ilə görüşüblər".[4]

---

[1] (Səhih) Əbu Davud /4878/, Əhməd 3/224.

[2] (Səhih) əl-Buxari /5973/, Muslim /90/.

[3] (Səhih) əl-Buxari /6045/, Muslim /61/.

[4] (Səhih) əl-Buxari /1393/.

# Əlli birinci böyük günah. Allahın dostlarına (övliyalarına) əziyyət vermək.

Uca Allah buyurur:

وَٱلَّذِينَ يُؤْذُونَ ٱلْمُؤْمِنِينَ وَٱلْمُؤْمِنَٰتِ بِغَيْرِ مَا ٱكْتَسَبُوا۟
فَقَدِ ٱحْتَمَلُوا۟ بُهْتَٰنًا وَإِثْمًا مُّبِينًا

**“Mömin kişiləri və mömin qadınları etmədikləri bir işdən ötrü günahlandıranlar, sözsüz ki, öz üzərilərinə böhtanla bərabər açıq-aydın ağır bir yük götürmüşlər”** [əl-Əhzab surəsi, 58-ci ayə].

Peyğəmbər ﷺ demişdir: “Kim mənim vəlimə düşmənçilik edərsə, Mən ona qarşı müharibə elan edərəm”. Digər bir ləfzdə: “Mənimlə mübarizə apararaq müharibə etmiş olar”.[1]

Başqa bir hədisdə Peyğəmbər ﷺ demişdir: “Ey Əbu Bəkr, əgər sən onları (kasıb mühacirləri) qəzəbləndirmisənsə, deməli Rəbbini qəzəbləndirmisən”.[2]

[1] (Səhih) əl-Buxari /6502/.
[2] (Səhih) Muslim /2504/.

# Əlli ikinci böyük günah. Qürurlanaraq paltarı isbal etmək və başqaları.

Uca Allah buyurur:

وَلَا تَمۡشِ فِي ٱلۡأَرۡضِ مَرَحًاۖ

**“yer üzündə özünü darta-darta gəzib dolanma”** [Loğman surəsi, 18-ci ayə].

Peyğəmbər ﷺ demişdir: “Paltarın topuğdan aşağı düşən hissəsi Cəhənnəmlikdir”.[1]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Paltarını təkəbbürlüklə uzadan şəxsə Allah nəzər salmaz”.[2]

O ﷺ eləcə də demişdir: “Qiyamət günü Allah üç şəxsə nəzər salmaz, onları təmizə çıxarmaz və onlara ağrıdıcı bir əzab verilər: Paltarını isballı geyən, söz gəzdirən və yalandan and-aman etməklə malını sərf edən”.[3]

Peyğəmbər ﷺ həmçinin demişdir: “İnsan saçını darayıb, libasını geyinib özünü bəzəyərək təkəbbürlə gəzdiyi zaman Allah onu yerə batırıb, Qiyamət gününə qədər onu çapalaya-çapalaya odda saxlayar”.[4]

---

[1] (Səhih) əl-Buxari /5787/.
[2] (Səhih) əl-Buxari /7588/, Muslim /2087/.
[3] (Səhih) Muslim /106/.
[4] (Səhih) əl-Buxari /5789/, Muslim /2088/.



Abdullah ibn Ömərdən ﵁ rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “İsbal paltarın aşağı hissəsində, köynəkdə və əmmamədə olur. Kim bunları təkəbbürlüklə uzadarsa, Qiyamət günü Allah ona nəzər salmaz”.[1]

Cəbir ibn Suleym ﵁ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ mənə dedi: “Paltarını isballa geyinməkdən çəkin, bu lovğalıqdandır. Şübhəsiz ki, Allah lovğalığı sevməz”.[2]

Əbu Hureyrə ﵁ demişdir: Bir nəfər paltarı isballı vəziyyətdə namaz qılarkən Peyğəmbər ﷺ ona: “get dəstəmaz al”– dedi. Həmin şəxs gedib dəstəmaz alıb gəldiyində, yenə də ona: “get dəstəmaz al”– dedi. Bir nəfər soruşdu: Ey Allahın rəsulu, nə üçün ona dəstəmaz almağı əmr edib, sonra susdun? Dedi: “O paltarı isbal vəziyyətində namaz qılırdı. Allah isbal vəziyyətində olanın namazını qəbul etməz”.[3]

Peyğəmbər ﷺ demişdir: “Kim lovğalıq edərək paltarını uzadıb arxasıyla sürüyərsə Allah Qiyamət günü ona nəzər salmaz”. Əbu Bəkr ﵁ dedi: Ey Allahın rəsulu, diqqət etmədiyim zaman paltarım aşağı enir. Dedi: “Sən bunu lovğalıqla edənlərdən deyilsən”.[4]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Möminin paltarının uzunluğu baldırının ortasına qədər olmalıdır”.[5]

Əbu Səid ﵁ Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: Möminin paltarının uzunluğu baldırının ortasına

---

[1] (Səhih) Əbu Davud /4094/, ən-Nəsai 8/208, ibn Məcə /3576/.

[2] (Səhih) ət-Tirmizi /2722/, Əbu Davud /4084/.

[3] (Zəif) Əbu Davud /4086,638/.

[4] (Səhih) əl-Buxari /5784/, Muslim /2085/.

[5] (Səhih) Əbu Davud /4093/, ibn Məcə /3573/.

qədər olmalıdır. Baldırının ortasından topuğuna qədər uzunluğu olan paltar geyinməkdə o, sərbəstdir. Topuğdan aşağı düşən nə varsa Cəhənnəmlikdir və paltarını lovğalıqla uzadan kəsə Allah nəzər salmaz".

İbn Ömər ﵄ demişdir: Bir dəfə paltarım aşağı düşmüş vəziyyətdə Peyğəmbərin ﷺ yanına getmişdim, o mənə dedi: "Ey Abdullah, paltarını yuxarı qaldır". Mən də qaldırdım, o dedi: "Bir az daha", bir az da qaldırdım, hələ də onu yoxlayıb diqqət edirəm".[1]

Ona görə əzab vədi cübbəsi, alt şalvarının və bu kimi bütün paltarlarının aşağı hissəsi yerə çatan hər bir şəxsə aid edilir.

---

[1] (Səhih) Muslim /2086/.

# Əlli üçüncü böyük günah. Kişinin ipək geyməsi və ya qızıl taxması.

Uca Allah buyurur:

وَلِبَاسُ ٱلتَّقْوَىٰ ذَٰلِكَ خَيْرٌۚ

**“Təqva libası isə daha xeyirlidir”** [əl-Əraf surəsi, 26-cı ayə].

Peyğəmbər ﷺ demişdir: “Dünyada ipək geyinən, axirətdə geyməz”.[1]

O ﷺ həmçinin demişdir: “İpəyi axirətdə payı olmayan kəs geyinər”.[2]

Peyğəmbər ﷺ həmçinin demişdir: “İpək və qızıl ümmətimin kişilərinə haram, qadınlarına isə halal edilmişdir”.[3]

Hüzeyfə رضي الله عنه demişdir: “Peyğəmbər ﷺ bizə qızıl və gümüş qablarda içməyi və yeməyi, ipək geyməyi və dibəc* üzərində oturmağı qadağan etdi”.[4]

Həmçinin ﷺ demişdir: “Qızıl və gümüş qablarda içən şəxs qarnında Cəhənnəm odunu quruldatmış olur”.[5]

---

[1] (Səhih) əl-Buxari /5832/, Muslim /2073/.

[2] (Səhih) əl-Buxari /5835/, Muslim /2068/.

[3] (Səhih) ət-Tirmizi /1720/, ən-Nəsai 8/161.

* Dibəc – bahalı ipək parça.

[4] (Səhih) əl-Buxari /5426/, Muslim /2067/.

[5] (Səhih) əl-Buxari /5634/, Muslim /2065/.

Peyğəmbərin ﷺ qaşınmadan dolayı və dörd barmaq miqdarında ipəyi, qızıl diş və sairəyə icazə verməsi sabitdir. Kim ipək paltar və ya qızıldan nəsə geyərsə, qeyd olunan əzab vədi ona şamil olunar. Bu cür də başqa şeylərə qiyas edin.



# Əlli dördüncü böyük günah. Kölənin sahibindən qaçması və s.

Peyğəmbər ﷺ demişdir: "(Sahibindən) qaçan kölənin namazı qəbul olmaz".[1]

O ﷺ həmçinin demişdir: "Kölə (sahibindən) qaçarsa, zimmət ondan qalxmış olar".[2]

Cabir رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Allah üç nəfərin namazını qəbul etməz və ona savab yazılmaz: Sahibinin yanına qayıdanadək ondan qaçmış qulun, ərini razı salana qədər ona qarşı qəzəblənilən qadının və ayılana qədər sərxoşun".[3]

Əlidən رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: "Ağasından üz çevirən köləyə Allah lənət edər".[4]

Fudala ibn Ubeyd رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Üç nəfərin aqibəti haqqında heç soruşma: Camaatdan ayrılıb, imama asi olaraq ölən şəxs, (sahibindən) qaçıb ölən qul və əri onu ərzaqla təmin edib harasa getdikdən sonra açıq-saçıq geyən qadın".[5]

---

[1] (Səhih) Muslim /70/.

[2] (Səhih) Muslim /69/.

[3] (Zəif) ibn Xuzeymə 2/69, ibn Hibbən /5331/.

[4] (Səhih) əl-Hakim 4/153.

[5] (Səhih) Əhməd 6/19, əl-Hakim 1/119.

# Əlli beşinci böyük günah. Allahdan başqasına qurban kəsmək – məsələn, cənab şeyxin adına – deyib kəsmək.

Uca Allah buyurur:

وَلَا تَأْكُلُوا۟ مِمَّا لَمْ يُذْكَرِ ٱسْمُ ٱللَّهِ عَلَيْهِ وَإِنَّهُۥ لَفِسْقٌ

**“Üstündə Allahın adı çəkilməmiş –** ***“bismilləh” deyilib kəsilməmiş heyvanlardan*** **yeməyin. Çünki bu, günahdır”** [əl-Ənam surəsi, 121-ci ayə].

Əlinin ﵁ belə dediyi rəvayət olunur: Ey Hani, insanlar nə danışırlar? Dedi: Onlar səndə, Allahın rəsulundan öyrəndiyin elm olduğunu və sənin onu gizlətdiyini iddia edirlər. Bunu eşidən Əli ﵁ qılncının qınının içindən bir səhifə çıxarıb: “Peyğəmbərdən ﷺ eşitdiyim bunlardır” dedi, “–Allahdan başqasına qurban kəsənə, ağasından üz çevirən köləyə, valideynlərinin üzünə ağ olana və öz ərazisinin sərhədlərini azaldan kəsə Allah lənət etmişdir”.[1]

[1] (Səhih) əl-Hakim 4/153.



# Əlli altıncı böyük günah.
# Ərazinin işarələrini dəyişmək.

Bunu edən şəxs Əlinin رضي الله عنه Peyğəmbərdən ﷺ rəvayət etdiyi hədisdə lənətlənmişdir.[1]

İbn Abbasdan رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “Allah, ondan başqasına qurban kəsənə, ərazinin işarələrini dəyişdirənə, korun yolunu çaşdırana, valideynlərini söyənə və Lut qövmünün etdiyi əməli edənə lənət eləsin”. Başqa bir ləfzdə belə bir əlavə də vardır: “Allah heyvanla cinsi yaxınlıq edənə lənət eləsin”.[2]

[1] (Səhih) əl-Hakim 4/153.

[2] (Səhih) ət-Tirmizi /1455/, Əbu Davud /4462/, ibn Məcə /2561/.



# Əlli yeddinci böyük günah. Böyük səhabələri söymək.

Peyğəmbər ﷺ demişdir: “İzzət və Cəlal sahibi olan Allah buyurur: “Mənim vəlimə əziyyət verənə qarşı müharibə elan edərəm”.[1]

Peyğəmbər ﷺ demişdir: “Mənim səhabələrimi söyməyin. Sizlərdən biriniz Uhud dağı qədər qızıl sədəqə versə belə, onun verdiyi sədəqə, onlardan birinin verdiyi bir ovuc sədəqəyə, hətta onun yarısına belə çatmaz”.[2]

Aişə رضي الله عنها demişdir ki; “Onlara, Muhəmmədin ﷺ səhabələri üçün bağışlanma diləmək əmr olundu, onlar isə səhabələri söydülər”.[3]

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “Mənim səhabələrimi söyənə Allahın lənəti olsun”.[4]

Əli رضي الله عنه demişdir: “Toxumu yarıb, (ondan) canlı Yaradana and olsun ki, bu yazıb-oxumaq bilməyən Peyğəmbərin ﷺ mənə olan əhdidir: “Məni ancaq mömin sevər və mənə yalnız münafiq nifrət edər”.[5]

Əgər Peyğəmbər ﷺ bunu Əli رضي الله عنه haqqında deyibsə, Siddiqə رضي الله عنه nifrət edənin münafiq olması daha çox labüddür. Çünki o Peyğəmbərdən ﷺ sonra bəşəriyyətin ən

---

[1] (Səhih) əl-Buxari /6502/.
[2] (Səhih) əl-Buxari /3673/, Muslim /2541/.
[3] (Səhih) Muslim /3022/.
[4] (Həsən) ibn Əbi Asimin “əs-Sünnə” əsəri /1001/.
[5] (Səhih) Muslim /78/.



xeyirlisidir. Hətta Ömər və Əlinin رضي الله عنه fikirlərinə görə kim bir nəfəri Siddiqdən رضي الله عنه daha əfzəl sayarsa, ona iftira yaxan şəxsə verilən cəza verilməlidir.

Əl-Cərud ibn əl-Mələ əl-Əbdi demişdir: Əbu Bəkr daha xeyirlidir, yoxsa Ömər? Başqa birisi dedi: Ömər Əbu Bəkrdən رضي الله عنه daha xeyirlidir. Bu gedib Ömərə رضي الله عنه çatdığı zaman ona ayaqları şişənə qədər kötək vurdu. Sonra o dedi: Şübhəsiz ki, Əbu Bəkr Peyğəmbərin ﷺ dostu və bu kimi şeylərdə insanların ən xeyirlisi idi. Kim bundan başqa bir şey deyərsə, ona iftira yaxan şəxsə verilən cəza vermək vacib olar".[1]

Əlqamə rəvayət edir ki, Əlinin رضي الله عنه belə dediyini eşitdim: "Mənə bəzi adamların məni Əbu Bəkr və Ömərdən رضي الله عنه üstün saydıqları gəlib çatıb. Belə bir şey deyən iftira yaxmış olur və ona iftira yaxana verilən cəzanı vermək lazımdır".[2]

Əli رضي الله عنه demişdir: "Məni Əbu Bəkr və Ömərdən daha üstün sayan şəxsi mənim yanıma gətirsələr, iftira yaxan şəxsə verilən cəzanı ona verəcəyəm".[3]

Peyğəmbər ﷺ demişdir: "Kim bir qardaşına: ey kafir deyərsə, onlardan birinə qayıdar".

Kim Əbu Bəkrə və onun kimi başqa səhabələrə: Ey kafir deyərsə, o zaman küfr qəti şəkildə onu deyənə qayıdar. Çünki Allah təala islamı ilk əvvəl qəbul edənlərdən razı olmuşdur. O buyurur:

---

[1] İbn Mərdəveyn /36088/.

[2] Əhməd 1/127.

[3] İbn Əsəkir /36103/.



وَٱلسَّـٰبِقُونَ ٱلۡأَوَّلُونَ مِنَ ٱلۡمُهَـٰجِرِينَ وَٱلۡأَنصَارِ وَٱلَّذِينَ ٱتَّبَعُوهُم بِإِحۡسَـٰنٖ رَّضِيَ ٱللَّهُ عَنۡهُمۡ وَرَضُواْ عَنۡهُ

**“Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsarlara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar”** [ət-Tövbə surəsi, 100-cü ayə][1].

Ona görə də bunları söyən Allaha qarşı müharibə elan etmiş olur. Hətta qeyd etdik ki, kim müsəlmanları söyüb, onlara əziyyət verib, onları alçaldarsa böyük günah işlətmiş olur. Bəs əgər söhbət Peyğəmbərdən ﷺ sonra bəşəriyyətin ən xeyirlisindən gedirsə, gör onda necə? Lakin bunu edən əbədi olaraq Cəhənnəmə vasil olmur. Yalnız kimsə Əlinin رضي الله عنه Peyğəmbər və ya ilah olmasını etiqad edərsə, o zaman o lənətə gələrək kafir olur.

[1] (Səhih) əl-Buxari /6104/, Muslim /60/.

# Əlli səkkizinci böyük günah.
# Ümumiyyətlə ənsarları söymək.

Peyğəmbər ﷺ demişdir: "Ənsarları sevmək imanın əlaməti, ənsarlara nifrət bəsləmək isə nifaqın əlamətidir".[1]

Həmçinin ﷺ demişdir: "Onları yalnız mömin sevər və yalnız münafiq onlara nifrət edər".[2]

[1] (Səhih) əl-Buxari /3784/, Muslim /74/.
[2] (Səhih) əl-Buxari /3783/, Muslim /75/.



# Əlli doqquzuncu böyük günah. Zəlalətə və ya pis yola çağırmaq.

Peyğəmbər ﷺ demişdir: “Kim (insanları) zəlalətə səsləyərsə ona tabe olanların günahı qədər ona da günah yazılar. Onun qazandığı günah onların günahlarından heç də əskik olmaz”.[1]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Kim pis bir yolun əsasını qoyarsa onun və ona əməl edənlərin günahı ona yazılar, onun günahı ona tabe olanların günahlarından heç də az olmaz”.[2]

O ﷺ həmçinin demişdir: “Dində hər bir yenilik çaşqınlıqdır”. Başqa bir ləfzdə: “hər bir çaşqınlıq oddadır”.[3]

[1] (Səhih) Muslim /2674/.
[2] (Səhih) Muslim /1017/.
[3] (Səhih) ət-Tirmizi /1105/, Əbu Davud /2118/, ən-Nəsai 3/105.



# Altmışıncı böyük günah. Başqasının saçını öz saçına birləşdirmək, orta dişlərinin ortasını aralamaq və dəri döydürmək.

Peyğəmbər ﷺ demişdir: “Allah (başqasının saçını) öz saçına calatdırana və calayana, dəri döydürənə və döyənə, qaşından və üzündən tük qopartmağı tələb edənə və bunu qopardana, gözəllik üçün dişlərini aralayana, bir də Allahın yaratdıqlarını dəyişdirənlərə lənət etmişdir”.[1]

O ﷺ həmçinin demişdir: “İtdən və qandan əldə edilən gəlir və fahişənin əldə etdiyi qazanc haramdır”. Sonra o dəri döydürənlərə və döyənlərə, riba yeyən və yedizdirənlərə və şəkil çəkənlərə lənət etmişdir”.[2]

---

[1] (Səhih) əl-Buxari /5931/, Muslim /2125/.

[2] (Səhih) əl-Buxari /2086/, Muslim /1567/.



# Altmış birinci böyük günah.
# Qardaşına dəmir parçası ilə işarə etmək.

Peyğəmbər ﷺ demişdir: "Kim qardaşına – hətta öz doğma qardaşı olsa belə, bir dəmir parçası ilə işarə edərsə, mələklər onu lənətləyər".[1]

[1] (Səhih) Muslim /2616/.

# Altmış ikinci böyük günah. Atasından qeyrisinin atalığını iddia etmək.

Səd رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim atasından qeyrisinin, onun atası olmadığını bilərək atalığını iddia edərsə, Cənnət ona haram olar”.[1]

Əbu Hüreyrədən رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “Atalarınızdan üz döndərməyin. Şübhəsiz ki, atadan üz döndərmək küfrdür”.[2]

Yəzid ibn Şərikdən rəvayət olunur ki, Mən Əlinin رضي الله عنه minbərdə xütbə verərkən belə dediyini eşitdim: Bizim Allahın kitabı və bu səhifədəkilərdən başqa oxumalı heç nəyimiz yoxdur. Sonra o səhifəni açdı, onun içərisində dəvə dişləri, yaralarla bağlı bəzi şeylər və bunlar var idi: Peyğəmbər ﷺ demişdir: “Eyrdən Səura qədər Mədinənin ərazisi haramdır. Kim orada pis bir iş çıxarar və ya çıxarana sığınacaq verərsə, ona Allahın, mələklərin bütün insanların lənəti olar. Qiyamət günü Allah ondan nə bir fərz, nə də bir nafilə qəbul etməz. Müsəlmanların zimməti birdir. Ən alt təbəqədə olan belə bu zimməti verə bilər. Kim bir müsəlmanı təhqir edərsə, ona Allahın, mələklərin və bütün insanların lənəti olar, kim atasından qeyrisinin atalığını ya öz sahiblərindən qeyrisinin onun sahibi olduğunu iddia edərsə, ona Allahın, mələklərin və bütün

[1] (Səhih) əl-Buxari /6766/, Muslim /63/.

[2] (Səhih) əl-Buxari /6768/, Muslim /62/.

insanların lənəti olar. Qiyamət günü Allah ondan nə fərz qəbul edər, nə də nafilə”.[1]

Əbu Zər ﵁ Peyğəmbərin belə dediyini eşitdiyini rəvayət etmişdir: “Bilərəkdən atasından qeyrisinin onun atası olduğunu iddia edən kəs küfr etmiş olur. Kim başqasının bir şeyinin onunku olduğunu iddia edərsə, bizdən deyil və Cəhənnəmdəki yerini hazır bilsin və kim birini “ey kafir!” və ya: “ey Allahın düşməni”– deyə çağırarsa, əgər elə deyilsə onun özünə qayıdar”.[2]

---

[1] (Səhih) əl-Buxari /1876/, Muslim /1370/.

[2] (Səhih) Əbu Davud /4878/, Əhməd 3/224.



# Altmış üçüncü böyük günah.
# Uğursuzluğu düşünmək.

Bunun böyük günahlardan olmaması ehtimalı var.

Abdullahdan ﷺ rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: "Uğursuzluğu düşünmək şirkdir və hər kəs uğursuzluğu düşünməkdən qabaq bu haqda zənnə düşür. Lakin Allah bunu təvəkküllə aparır.[1]

Peyğəmbər ﷺ demişdir: "Keçici xəstəlik və bədbinliyə düşmək yoxdur. Amma fəli isə sevirəm. Dedilər: Ey Allahın rəsulu, fəl nə olan şeydir? O dedi: "Gözəl söz".[2]

[1] (Səhih) Əbu Davud /3910/, ət-Tirmizi /1614/.
[2] (Səhih) əl-Buxari /5756/, Muslim /2224/.



# Altmış dördüncü böyük günah. Qızıl və ya gümüş qabda içmək.

Peyğəmbər ﷺ demişdir: “İpək və bir üzü qabardılmış bahalı parça geyməyin, qızıl və gümüş qablarda içməyin, o cür qablarda yeməyin. Çünki bunlar dünyada onların, axirətdə isə sizin üçündür”.[1]

Peyğəmbər ﷺ demişdir: “Şübhəsiz ki, qızıl və gümüş qablarda yeyib-içən şəxs qarnında Cəhənnəm odunu quruldatmış olur”.[2]

O ﷺ həmçinin demişdir: “Kim gümüş qabda içərsə, axirətdə ondan içməkdən məhrum olar”.[3]

[1] (Səhih) əl-Buxari /5426/, Muslim /2067/.

[2] (Səhih) əl-Buxari /5634/, Muslim /2065/.

[3] (Səhih) Muslim /2066/.



## Altmış beşinci böyük günah. Şiddətli bir şəkildə mübahisə və mücadilə etmək və Qazilərə vəkillik etmək.

Uca Allah buyurur:

وَمِنَ ٱلنَّاسِ مَن يُعۡجِبُكَ قَوۡلُهُۥ فِي ٱلۡحَيَوٰةِ ٱلدُّنۡيَا وَيُشۡهِدُ ٱللَّهَ عَلَىٰ مَا فِي قَلۡبِهِۦ وَهُوَ أَلَدُّ ٱلۡخِصَامِ ﴿٢٠٤﴾ وَإِذَا تَوَلَّىٰ سَعَىٰ فِي ٱلۡأَرۡضِ لِيُفۡسِدَ فِيهَا وَيُهۡلِكَ ٱلۡحَرۡثَ وَٱلنَّسۡلَۚ

**“İnsanların eləsi də var ki, onun bu dünya həyatında danışdığı sözlər səni heyran edər. O, qəlbində olana Allahı şahid göstərər. Əslində o, ən qatı mübahisəçidir. O, dönüb getdikdə yer üzündə fitnə-fəsad törətməyə, əkinləri və nəsilləri məhv etməyə çalışar...”** [əl-Bəqərə surəsi, 204-205-ci ayələr].

مَا ضَرَبُوهُ لَكَ إِلَّا جَدَلَۢاۚ بَلۡ هُمۡ قَوۡمٌ خَصِمُونَ

**“Onlar bunu sənə yalnız höcət etmək üçün dedilər. Doğrusu, onlar höcətləşən adamlardır”** [əz-Zuxruf surəsi, 58-ci ayə].

إِنَّ ٱلَّذِينَ يُجَٰدِلُونَ فِيٓ ءَايَٰتِ ٱللَّهِ بِغَيۡرِ سُلۡطَٰنٍ أَتَىٰهُمۡ إِن فِي صُدُورِهِمۡ إِلَّا كِبۡرٞ مَّا هُم بِبَٰلِغِيهِۚ

**“Həqiqətən, özlərinə bir dəlil gəlmədən Allahın ayələri barəsində mübahisə edənlərin ürəklərində böyüklük iddiasından başqa bir şey yoxdur. Onlar heç vaxt buna çatmayacaqlar”** [Ğafir surəsi, 56-cı ayə].

وَلَا تُجَٰدِلُوٓاْ أَهۡلَ ٱلۡكِتَٰبِ إِلَّا بِٱلَّتِي هِيَ أَحۡسَنُ

**“... Kitab əhli ilə ən gözəl tərzdə mübahisə edin...”** [əl-Ənkəbut surəsi, 46-cı ayə]

Peyğəmbər ﷺ demişdir: “Allah təalanın ən çox nifrət etdiyi şəxs şiddətli mübahisə edəndir”.[1]

Əbu Hüreyrədən رضي الله عنه rəvayət olunan hədisdə Peyğəmbər ﷺ demişdir: “Kim elmsiz olaraq mübahisə edərsə, bunu tərk etmədiyi müddətdə Allahın qəzəbinə düçar olar”.[2]

Əbu Uməmədən رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “Hidayət olunduqdan sonra zəlalətə uğrayan hər bir qövmə mübahisə verilər, sonra o bu ayəni oxudu:

مَا ضَرَبُوهُ لَكَ إِلَّا جَدَلَۢاۚ بَلۡ هُمۡ قَوۡمٌ خَصِمُونَ

**“Onlar bunu sənə yalnız höcət etmək üçün dedilər. Doğrusu, onlar höcətləşən adamlardır”** [əz-Zuxruf surəsi, 58-ci ayə][3].

---

[1] (Səhih) əl-Buxari /2457/, Muslim /2668/.

[2] (Həsən) ibn Əbi Dünyə /153/, ət-Təbərani 1/161/1.

[3] (Həsən) ət-Tirmizi /3250/, ibn Məcə /48/, Əhməd 5/252.

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur ki; "Ümmətim üçün ən çox qorxduğum şeylər alimin xətası, münafiqin Quran barəsində mübahisəsi və sizi məhv edəcək dünyadır".[1]

Peyğəmbər ﷺ demişdir: "Quran barəsində mübahisə etmək küfrdür".[2]

İbn Ömər رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim haqsız olduğunu bilərək mübahisə edərsə, bu əməlinə son qoymayınca Allahın qəzəbində olar". Başqa bir ləfzdə: "Allahın qəzəbinə düçar olar".[3]

Peyğəmbər ﷺ demişdir: "Ümmətim üçün ən çox qorxduğum şəxs dil pəhləvanı olan münafiqdir".[4]

O ﷺ həmçinin demişdir: "Həya və az danışmaq imanın, pis şeylər danışmaq və danışanda öyünmək isə nifaqın iki şöbəsidir".[5]

[1] (Zəif) ət-Təbərani 20/138, 139.
[2] (Səhih) Əbu Davud /4603/, Əhməd 2/258, əl-Hakim 2/223.
[3] (Səhih) Əbu Davud /3597/, Əhməd 2/70.
[4] (Səhih) Əhməd 1/22, 44.
[5] (Səhih) ət-Tirmizi /2028/, Əhməd 5/269, əl-Hakim 1/9.



# Altmış altıncı böyük günah.
# Köləsini xədim etmək, onun hər hansı bir üzvünü kəsmək və ya ona zülm edərək işgəncə vermək.

Uca Allah iblisin belə dediyini buyurur:

وَلَأُضِلَّنَّهُمْ وَلَأُمَنِّيَنَّهُمْ وَلَآمُرَنَّهُمْ فَلَيُبَتِّكُنَّ ءَاذَانَ ٱلْأَنْعَٰمِ وَلَآمُرَنَّهُمْ فَلَيُغَيِّرُنَّ خَلْقَ ٱللَّهِ ۚ

**“Mən onları mütləq *doğru yoldan* azdıracaq və xülyalara salacağam; onlara mal-qaranın qulaqlarını kəsməyi buyuracaq və Allahın yaratdıqlarına dəyişiklik verməyi əmr edəcəyəm...”** [ən-Nisa surəsi, 119-cu ayə].

Bəzi təfsir alimləri burada xədim etmənin nəzərdə tutulduğunu demişlər.

Səmurradan ﵁ rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “Kim öz köləsini qətlə yetirərsə, biz də onu öldürər, köləsinin bədən üzvünü kəsənin Biz də həmin bədən üzvünü kəsərik”. Səmurra ﵁ Peyğəmbərin belə dediyini də rəvayət etmişdir: “Kim öz köləsini xədim edərsə, Biz də onu o günə salarıq”.[1]

[1] (Zəif) Əbu Davud /4516-4516-, ət-Tirmizi /1414/.

Cəzalar bölməsində əl-Hakim xəta edib bu hədisə səhih demişdir: "Kim öz köləsi ilə sərt davranarsa, həmin kölə azad olur".[1]

əl-Buxari və Muslimin "Səhih" əsərlərində isə belə bir hədis vardır: "Kim köləsini zina etməkdə ittiham edərsə, Qiyamət günü ona şəriət cəzası verilər".[2]

Peyğəmbərdən ﷺ ən son öyrənilənlər bunlardır: "Namazlarınıza, namazlarınıza və kölələrinizə diqqət yetirin, kölələrinizə qarşı pis davranmaqdan çəkinərək Allahdan qorxun".[3]

İmam Əhmədin "əl-Müsnəd" əsərində isə ibn Ömərdən رضي الله عنه rəvayət olunan hədisdə isə: "Peyğəmbər ﷺ atı və ya heyvanları xədim etməyi qadağan etmişdir".[4]

---

[1] (Zəif) əl-Hakim 4/368.

[2] (Səhih) əl-Buxari /6858/, Muslim /1660/.

[3] (Səhih) Əbu Davud /5156/, ibn Məcə /2698/.

[4] (Zəif) Əhməd 2/24, əl-Beyhəqi 10/24.

## Altmış yeddinci böyük günah.
## Çəkidə və ölçüdə aldatmaq.

Uca Allah buyurur:

وَيۡلٞ لِّلۡمُطَفِّفِينَ ١ ٱلَّذِينَ إِذَا ٱكۡتَالُواْ عَلَى ٱلنَّاسِ يَسۡتَوۡفُونَ ٢ وَإِذَا
كَالُوهُمۡ أَو وَّزَنُوهُمۡ يُخۡسِرُونَ ٣ أَلَا يَظُنُّ أُوْلَٰٓئِكَ أَنَّهُم مَّبۡعُوثُونَ ٤
لِيَوۡمٍ عَظِيمٖ ٥ يَوۡمَ يَقُومُ ٱلنَّاسُ لِرَبِّ ٱلۡعَٰلَمِينَ ٦

**"Çəkidə və ölçüdə aldadanların vay halına! O kəslərin ki, camaatdan *bir şey* aldıqda *onu* tam almaq istəyərlər, onlar üçün *bir şey* ölçdükdə və ya çəkdikdə *onu* ziyana salarlar. Onlar dirildiləcəklərini fikirləşmirlərmi? *Həm də* əzəmətli bir gündə. O gündə ki, insanlar aləmlərin Rəbbinin qarşısında dayanacaqlar"** [əl-Muttaffifin surəsi, 1-6-cı ayələr].

Bu əməl oğurluğun, xəyanətin və haqsız mal yeməyin bir növüdür.



# Altmış səkkizinci böyük günah. Allahın məkrindən qorxmayaraq arxayınlaşmaq.

Uca Allah buyurur:

فَلَا يَأْمَنُ مَكْرَ ٱللَّهِ إِلَّا ٱلْقَوْمُ ٱلْخَٰسِرُونَ

**"Allahın hiyləsindən yalnız ziyana uğrayanlar ehtiyat etməzlər!"** [əl-Əraf surəsi, 99-cu ayə].

حَتَّىٰٓ إِذَا فَرِحُوا۟ بِمَآ أُوتُوٓا۟ أَخَذْنَٰهُم بَغْتَةً فَإِذَا هُم مُّبْلِسُونَ

**"Özlərinə verilən şeylərə sevindikləri vaxt isə onları qəflətən yaxaladıq və onlar naümid qaldılar"** [əl-Ənam surəsi, 44-cü ayə].

إِنَّ ٱلَّذِينَ لَا يَرْجُونَ لِقَآءَنَا وَرَضُوا۟ بِٱلْحَيَوٰةِ ٱلدُّنْيَا وَٱطْمَأَنُّوا۟ بِهَا
وَٱلَّذِينَ هُمْ عَنْ ءَايَٰتِنَا غَٰفِلُونَ ﴿٧﴾ أُو۟لَٰٓئِكَ مَأْوَىٰهُمُ
ٱلنَّارُ بِمَا كَانُوا۟ يَكْسِبُونَ ﴿٨﴾

**"Şübhəsiz ki, Bizimlə qarşılaşacaqlarına ümid etməyənlər, dünya həyatından razı qalıb onunla rahatlıq tapanlar və ayələrimizdən xəbərsiz olanların – məhz onların qazandıqları *günahlara* görə sığınacaqları yer Oddur"** [Yunus surəsi, 7-8-ci ayə].

# Altmış doqquzuncu böyük günah. Allahın mərhəmətindən ümidini üzmək və ümidsizliyə qapılmaq.

Uca Allah buyurur:

إِنَّهُۥ لَا يَاْيۡـَٔسُ مِن رَّوۡحِ ٱللَّهِ إِلَّا ٱلۡقَوۡمُ ٱلۡكَٰفِرُونَ

**"Allahın mərhəmətindən ancaq kafir adamlar ümidlərini kəsər"** [Yusuf surəsi, 87-ci ayə]

وَهُوَ ٱلَّذِى يُنَزِّلُ ٱلۡغَيۡثَ مِنۢ بَعۡدِ مَا قَنَطُواْ وَيَنشُرُ رَحۡمَتَهُۥۚ

**"*İnsanlar* ümidlərini kəsdikdən sonra yağış endirən və Öz mərhəmətini *hər yana* yayan Odur"** [əş-Şura surəsi, 28-ci ayə].

قُلۡ يَٰعِبَادِىَ ٱلَّذِينَ أَسۡرَفُواْ عَلَىٰٓ أَنفُسِهِمۡ لَا تَقۡنَطُواْ مِن رَّحۡمَةِ ٱللَّهِۚ

**"Ey Mənim özlərinə qarşı həddi aşmış qullarım! Allahın rəhmindən ümidinizi üzməyin"** [əz-Zumər surəsi, 53-cü ayə].

Peyğəmbər ﷺ demişdir: "Ölərkən Allah təalaya qarşı yaxşı zənn edərək ölün".[1]

---

[1] (Səhih) Muslim /2877/.



# Yetmişinci böyük günah. Yaxşılıq edənin nemətinə qarşı nankorluq etmək.

Uca Allah buyurur:

أَنِ ٱشْكُرْ لِي وَلِوَٰلِدَيْكَ

**"Mənə və valideynlərinə şükr et!"** [Loğman surəsi, 14-cü ayə].

Peyğəmbər ﷺ demişdir: "İnsanlara təşəkkür etməyən adam Allaha da şükr etməz".[1]

Sələflərdən bəzilərinin belə dediyi rəvayət olunur: Nemətə qarşı nankorluq etmək böyük günahlardandır. Onun təşəkkürü əvəzini vermək və ya ona dua etməkdir.

[1] (Səhih) ət-Tirmizi /1955/, Əbu Davud /4811/, Əhməd 2/302-303/.



## Yetmiş birinci böyük günah.
## Artıq suyu kəsmək.

Uca Allah buyurur:

قُلْ أَرَءَيْتُمْ إِنْ أَصْبَحَ مَآؤُكُمْ غَوْرًا فَمَن يَأْتِيكُم بِمَآءٍ مَّعِينٍ

**“De: “Deyin görüm, əgər suyunuz *yerin dibinə çöksə, Allahdan başqa* kim sizə axar su gətirə bilər?”** [əl-Mülk surəsi, 30-cu ayə].

Peyğəmbər ﷺ demişdir: “Ota su verməmək üçün suyun qarşısını kəsməyin”.[1]

O ﷺ həmçinin demişdir: “Artıq suyu satmayın”.[2]

Amr ibn Şüeyb atasından, o da öz atasından Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Kim əlavə suyu və ya otların suyunu (başqalarına) verməzsə, Qiyamət günü Allah onu öz fəzilətindən məhrum edər”.[3]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Qiyamət günü Allah üç nəfəri danışdırmaz, onlara nəzər salmaz, onları təmizə çıxarmaz və onlara ağrıdıcı bir əzab verilər: Qabda artıq suyu ola-ola suyun artığını yoldan keçənə verməyən, dünya mənfəəti xatirinə imama beyət edən şəxs, həmin imam ona istədiyini versə, ona qarşı vəfalı, verməzsə ona qarşı vəfasız olar və o kəs ki, axşamçağı bir nəfər birinə bir

---

[1] (Səhih) əl-Buxari /2354/, Muslim /1566/.

[2] (Səhih) əl-Buxari /2353/.

[3] (Səhih) Əhməd 2/179-221.



şey satıb onu inandırmaqdan ötrü andaman edir ki, malı bu qiymətə alıb, ancaq bu doğru deyil”.

əl-Buxarinin rəvayətində bu əlavə vardır: “və artıq suyu kəsən şəxs. Allah təala ona belə buyurar; “Suyun artığını kəsdiyin kimi, Mən də bu gün sənə qarşı öz fəzilətimi kəsib məhrum edərəm”.[1]

[1] (Səhih) əl-Buxari /2358/, Muslim /108/.



# Yetmiş ikinci böyük günah.
# Bir canlının üzünə damğa basmaq.

Cabir ﷺ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ üzünə damğa basılmış bir uzunqulağın yanından keçərkən belə dedi: "Allah bunu damğalayana lənət etsin".[1]

Əbu Davudun rəvayətində isə ﷺ demişdir: "Məgər sizə gəlib-çatmayıbmı ki, heyvanın üzünə damğa basanı və onun üzünə vuranı lənətləmişəm?" Bununla da o, bunu qadağan etdi.[2]

Peyğəmbərin ﷺ: "Məgər mənim lənətlədiyim sizə gəlib çatmayıbmı?"– sözü ona dəlalət edir ki, bu xəbəri eşitməyən günah qazanmır. Çünki lənət xəbəri eşidib bilən şəxsə aiddir. Dində bilinməsi zəruri olanlar istisna olmaqla, o biri böyük günahlar da bu cürdür.

[1] (Səhih) Muslim /2117/.
[2] (Səhih) Əbu Davud /2564/.



# Yetmiş üçüncü böyük günah. Qumar oynamaq.

Uca Allah buyurur:

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِنَّمَا ٱلۡخَمۡرُ وَٱلۡمَيۡسِرُ وَٱلۡأَنصَابُ وَٱلۡأَزۡلَٰمُ رِجۡسٞ مِّنۡ عَمَلِ
ٱلشَّيۡطَٰنِ فَٱجۡتَنِبُوهُ لَعَلَّكُمۡ تُفۡلِحُونَ ﴿٩٠﴾ إِنَّمَا يُرِيدُ ٱلشَّيۡطَٰنُ أَن يُوقِعَ
بَيۡنَكُمُ ٱلۡعَدَٰوَةَ وَٱلۡبَغۡضَآءَ فِي ٱلۡخَمۡرِ وَٱلۡمَيۡسِرِ وَيَصُدَّكُمۡ عَن ذِكۡرِ ٱللَّهِ وَعَنِ
ٱلصَّلَوٰةِۖ فَهَلۡ أَنتُم مُّنتَهُونَ ﴿٩١﴾

**“Ey iman gətirənlər! Şübhəsiz ki, sərxoşedici *içki* də, qumar da, *tapınmaq məqsədilə* dik qoyulmuş daşlar da, fal oxları da şeytan əməlindən olan murdar şeylərdir. Bunlardan çəkinin ki, bəlkə nicat tapasınız. Həqiqətən, şeytan sərxoşedici *içki* və qumar vasitəsilə sizin aranıza ədavət və kin salmaq, sizi Allahı yad etməkdən və namazdan ayırmaq istəyər. Siz *buna* son qoyacaqsınızmı?”** [əl-Maidə surəsi, 90-91-ci ayələr]

İnsanların mallarını haqsız olaraq yeyənlərin qazandıqları günahlar barəsində uca Allah başqa ayələr də nazil etmişdir.

Peyğəmbər ﷺ demişdir: “Kim bir qardaşına: gəl qumar oynayaq– deyərsə, sədəqə versin”.[1]

---

[1] (Səhih) əl-Buxari /4860/, Muslim /1647/.

Əgər təkcə bunu demək kəffarə olaraq sədəqə verməyi vacib edirsə, fikirləş gör bu əməli etmək necə? Bu əməl insanların mallarını haqsız yeməyə daxildir.



# Yetmiş dördüncü böyük günah. “Məscidülharam”da zülmə, haqsızlığa meyl etmək.

Uca Allah buyurur:

إِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ وَيَصُدُّونَ عَن سَبِيلِ ٱللَّهِ وَٱلْمَسْجِدِ ٱلْحَرَامِ ٱلَّذِى جَعَلْنَـٰهُ لِلنَّاسِ سَوَآءً ٱلْعَـٰكِفُ فِيهِ وَٱلْبَادِ ۚ وَمَن يُرِدْ فِيهِ بِإِلْحَادٍۭ بِظُلْمٍ نُّذِقْهُ مِنْ عَذَابٍ أَلِيمٍ

**“Kafir olanlara, *insanları* həm Allah yolundan, həm də bütün insanlar – istər yerlilər, istərsə də gəlmələr üçün qurduğumuz Məscidulharamdan sapdıranlara və orada zülm etməklə *haqdan* dönmək istəyənlərə ağrılı-acılı bir əzab daddıracağıq”** [əl-Həcc Surəsi, 25-ci ayə].

Ubeyd ibn Übeyd öz atasından rəvayət edir ki, Peyğəmbər ﷺ Vida həccində demişdir: “Şübhəsiz ki, Allahın dostları (övliyaları) namaz qılanlardır. O kəslər ki, namazı layiqincə icra edər, Ramazan ayında oruc tutar, savabını Allahdan umaraq mallarının zəkatını verər və Allahın qadağan etdiyi böyük günahlardan çəkinərlər”. Sonra bir nəfər ondan soruşdu: Ey Allahın rəsulu, böyük günahlar hansılardır? Dedi: “Onlar doqquz ədəddir: Allaha şərik qoşmaq, haqsız yerə mömini öldürmək, hücum vaxtı (ordudan) qaçmaq, yetimin malını yemək, faiz yemək,

günahsız mömin qadınları zinada ittiham etmək, müsəlman valideynələrin üzünə ağ olmaq və Beytul-Həramda (dirilərə və ya ölülərə qarşı) zülm etmək". Sonra o dedi: "Kim bu günahları etməyib, namaz qılıb, zəkat verərək ölərsə, Peyğəmbərlə ﷺ birgə qapılarının kənarı qızıldan olan evdə olar".[1]

Peyğəmbər ﷺ demişdir: "Şübhəsiz ki, Allahın ən böyük düşməni "əl-Həram"da qətl törədən, qatilini deyil başqasını qətlə yetirən və ya cahiliyyət düşmənçiliyi ilə qətl törədəndir".[2]

[1] (Həsən) Əbu Davud /2875/, ən-Nəsai 7/89, əl-Hakim 1/59.
[2] (Səhih) Əhməd 2/179.



# Yetmiş beşinci böyük günah. Tək özü namaz qılmaq üçün cüməni tərk etmək.

İbn Məsud رضي الله عنه rəvayət etmişdir ki, Peyğəmbər ﷺ cüməni tərk edənlər haqqında demişdir: "Fikirləşirəm ki, bir nəfəri namazı qıldırmağı əmr etdikdən sonra, gedib cüməni tərk edənlərin evlərini yandırım".[1]

Peyğəmbər ﷺ həmçinin demişdir: "Ya insanlar cüməni tərk etməyə son qoyacaq, ya da Allah onların qəlblərini möhürləyəcək, sonra da onlar qafillərdən olacaqlar".[2]

Əbu əl-Cəd əd-Damri رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim öz səhlənkarlığı ucbatından üç cüməni tərk edərsə, Allah onun qəlbini möhürləyər".[3]

Həfsa رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Həddi büluğa çatmış hər kəsə cüməyə getmək vacibdir".[4]

---

[1] (Səhih) Muslim /652/.

[2] (Səhih) Muslim /865/.

[3] (Səhih) Əbu Davud /1052/, ət-Tirmizi /500/.

[4] (Səhih) Əbu Davud /342/, ən-Nəsai 3/89.

# Yetmiş altıncı böyük günah. Müsəlmanların arasında casusluq edib onların sirlərini araşdırmaq.

Bu fəsildə Hatib ibn Əbi Bəltəənin hədisi variddir ki, Ömər ﵁ onu etdiyi əmələ görə öldürmək istərkən, Peyğəmbər ﷺ Bədr döyüşündə iştirak etdiyinə görə onu öldürməyə qoymamışdır”.[1]

Lakin onun bu cəsusluğunu islamın və müsəlmanların zəifləməsinə, müsəlmanların ölümünə, əsir alınmasına, zorla alınmasına və ya bunun kimi bir şeyə səbəb olarsa, o zaman o, yer üzündə fəsad törədərək gəzib əkini və nəsili məhv edən kəslərdəndir. Onun qətlə yetirilməsi təyin olunaraq ona əzab olunması labüd olur. Allah bizi bu cür əməllərdən qorusun. Bununla bərabər hər bir casus söz gəzdirməyin böyük günah olduğunu bilir. Cəsusluq edənin söz gəzdirməsi isə daha günahdır.

[1] (Səhih) əl-Buxari /3007/, Muslim /2494/.



# Böyük günah olması ehtimal edilən günahların məcmusu.

Peyğəmbər ﷺ demişdir: "Özü üçün istədiyini qardaşı üçün istəməyən kəs iman gətirməyib".[1]

O ﷺ eləcə də demişdir: "Sizlərdən hər biriniz məni ailəsindən, övladından, özündən və bütün insanlardan çox sevməyincə iman gətirmiş olmaz".[2]

Peyğəmbər ﷺ həmçinin demişdir: "Nəfsinin istəkləri mənim gətirdiyimə tabe olmayan şəxs iman gətirmiş olmaz".[3]

Peyğəmbər ﷺ həmçinin demişdir: "Allaha and olsun ki, qonşusu onun pisliyindən əmin olmayan kəs, iman gətirmiş olmaz".[4]

O ﷺ həmçinin demişdir: "Kim bir münkər görərsə, onu əli ilə, bacarmazsa dili ilə dəyişdirsin. Əgər onu da bacarmazsa qəlbində buna qarşı öz etirazını bildirsin. Bu da imanın ən zəifidir".[5]

Muslimin zülm edənlər haqqında rəvayət etdiyi hədisdə isə deyilir: "Onlara qarşı əli ilə cihad aparan mömindir, onlara qarşı dili ilə cihad aparan mömindir, onlara qarşı qəlbi ilə cihad aparan mömindir. Bundan əlavə bir xardal dənəsi qədər belə iman yoxdur. (Yəni bu tamamilə

[1] (Səhih) əl-Buxari /13/, Muslim /45/.
[2] (Səhih) əl-Buxari /15/, Muslim /44/.
[3] (Zəif) əl-Buğavi "əl-Sünnə"nin şərhi 1/213.
[4] (Səhih) Muslim /46/.
[5] (Səhih) Muslim /49/.



imanın özüdür). Bu ona dəlalət edir ki, kim pis işlərə qəlbiylə belə narazı olmayaraq, onun aradan qaldırılmasını istəməzsə, deməli onun imanı yoxdur. Qəlbi cihadın bir növü də ya onları və etdikləri əməlləri yox etsin, ya da onları islah etsin deyə Allaha dua etməkdir”.[1]

Peyğəmbər ﷺ demişdir: “Vaxt gələcək sizə elə əmirlər başçılıq edəcək ki, onları görüb bəyənməyəcəksiniz. Kim onlara nifrət bəsləsə qurtular, onları bəyənməyən salamatlığa çıxar, lakin razı qalan onlara tabe olar”. Dedilər: onlara qarşı vuruşmayaqmı? Dedi: “Nə qədər ki, sizinlə namaz qılırlar yox”.[2]

Bir dəfə Peyğəmbər ﷺ iki qəbrin yanından keçərkən demişdir: “Onlar əzab çəkirlər. Onlara verilən əzab çox böyük bir səbəbə görə deyil. Bəli əslində bu böyük günahdır: Onlardan biri sidikdən təmizlənmirdi”. Digər bir ləfzdə: “sidikdən qorunmurdu, digəri isə söz gəzdirirdi” deyilir.[3]

İbn Ömər رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mübahisə zamanı haqsız olan tərəfə yardım edən bu əməldən əl çəkməyincə Allahın qəzəbində olar”.[4]

O ﷺ həmçinin demişdir: “Aldatma və hiylə gəlmə əməllərinin sahibi Cəhənnəmdə olacaqdır”.[5]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Allah muhəllil və muhəlləl ləhuya lənət eləsin”. (Yəni 3 dəfə boşanılmış qadınla

---

[1] (Səhih) Muslim /50/.
[2] (Səhih) Muslim /1853/.
[3] (Səhih) əl-Buxari /216/, Muslim /292/.
[4] (Səhih) Əbu Davud /3597/, Əhməd 2/70.
[5] (Səhih) ət-Təbəraninin “Böyük” əsəri /10234/.



birinci ərinə yenidən halal olsun deyə boşamaq niyyəti ilə evlənən kişi və qadın nəzərdə tutulur)[1].

O ﷺ həmçinin demişdir: "Kim birinin zövcəsini və ya köləsini aldadıb pozarsa, bizdən deyil".[2]

Peyğəmbər ﷺ eləcə də demişdir: "Az danışmaq və həya imanın, pis danışıq və kobud davranma isə nifaqın iki şöbəsidir".[3]

Peyğəmbər ﷺ demişdir: "Həya imandan, iman isə Cənnətdədir. Pis danışıq kobud davranışdır. Kobud davranış isə Cəhənnəmdədir".[4]

O ﷺ həmçinin demişdir: "Kim camaat imamı olmadan ölərsə, onun ölümü cahilliyə ölümüdür".[5]

Mustəvrid ibn əl-Şəddəd رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Kim bir müsəlmanın bir loxma malını yeyərsə, Qiyamət günü Allah ona bir loxma od daddırar. Kim bir müsəlmana haqsızlıq edərək yüksək bir etibar qazanarsa, Allah da Qiyamət günündə ona (Cəhənnəmdə) bir yer hazırlayar. Kim haqsız olaraq bir müsəlmanın libasını geyinərsə, Allah Qiyamət günündə ona atəşdən bir libas geyindirər.[6]

---

[1] (Səhih) ən-Nəsai 6/149, ət-Tirmizi /1120, (Səhih) Əbu Davud /2076, ət-Tirmizi /1119.

[2] (Səhih) Əbu Davud /5170/, Əhməd 2/397.

[3] (Səhih) ət-Tirmizi /2028/, Əhməd 5/269, əl-Hakim 1/9.

[4] (Səhih) ət-Tirmizi /2010/, Əhməd 2/501.

[5] (Həsən) Əhməd 4/96, əl-Hakim 1/77.

[6] (Səhih) Əbu Davud /4881/, Əhməd 4/229, əl-Hakim 4/127-128.



İbn Ömər رضي الله عنه Peyğəmbərin belə dediyini rəvayət etmişdir: “Kim Allahın cəzalarından biri olmadan (başqa hökmlərdə) şəfaətçilik edərsə, Allahla tərs düşmüş olar”.[1]

Peyğəmbər ﷺ demişdir: “İnsan heç fikirləşmədən Allahın qəzəbinə səbəb olan bir söz deməklə Cəhənnəmə vasil ola bilər”.[2]

O ﷺ həmçinin demişdir: “Ola bilsin ki, insan heç mənasına belə varmadan bir söz deməklə Allahın razılığını qazansın və Allah o sözə görə Qiyamət gününə qədər ondan razı qalsın. Eləcə də ola bilsin ki, insan heç mənasına belə varmadan bir söz söyləməklə Allahın qəzəbinə gəlsin və Allah o sözə görə onunla görüşəcəyi günə qədər ona qarşı qəzəbli olsun”.[3]

Bureydə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Münafiq olan bir kəsə “cənab” deməyin. Çünki həmin adam cənab olsa belə siz (bunu deməklə) İzzət və Cəlal sahibi olan Rəbbinizi qəzəbləndirmiş olursunuz”.[4]

Peyğəmbər ﷺ həmçinin demişdir: “Münafiqin üç əlaməti var: “Danışdığı zaman yalan danışar, vədinə xilaf çıxar və əmanət olunduğu zaman ona xəyanət edər”.[5]

Yalan danışmaq və əmanətə xəyanət etmək barəsində söhbət açmışıq. Burada isə vədə xilaf çıxmağı nəzərdə tuturuq. Uca Allah buyurur:

---

[1] (Səhih) Əbu Davud /3597/, Əhməd 1/70.
[2] (Səhih) əl-Buxari /6478/, Muslim /2988/.
[3] (Səhih) ət-Tirmizi /2320/, ibn Məcə /3969/, Əhməd 3/469.
[4] (Səhih) Əbu Davud /4977/, Əhməd 5/346, əl-Hakim 4/311.
[5] (Səhih) əl-Buxari /33/, Muslim /59/.



وَمِنْهُم مَّنْ عَـٰهَدَ ٱللَّهَ لَئِنْ ءَاتَـٰنَا مِن فَضْلِهِۦ لَنَصَّدَّقَنَّ وَلَنَكُونَنَّ مِنَ ٱلصَّـٰلِحِينَ ﴿٧٥﴾ فَلَمَّآ ءَاتَـٰهُم مِّن فَضْلِهِۦ بَخِلُوا۟ بِهِۦ وَتَوَلَّوا۟ وَّهُم مُّعْرِضُونَ ﴿٧٦﴾ فَأَعْقَبَهُمْ نِفَاقًا فِى قُلُوبِهِمْ إِلَىٰ يَوْمِ يَلْقَوْنَهُۥ بِمَآ أَخْلَفُوا۟ ٱللَّهَ مَا وَعَدُوهُ وَبِمَا كَانُوا۟ يَكْذِبُونَ ﴿٧٧﴾

**“Onlardan: “Əgər *Allah* Öz lütfündən bizə bəxş etsə, əlbəttə, biz sədəqə verər və əməlisalehlərdən olarıq!”– *deyə* Allaha əhd edənləri də vardır. *Allah* Öz lütfündən onlara verdikdə isə simiclik edərək üz çevirib getdilər. Allaha verdikləri vədə xilaf çıxdıqlarına və yalan söylədiklərinə görə *Allah da* onların qəlblərinə Onunla qarşılaşacaqları günədək nifaq saldı”** [əl-Tövbə surəsi, 75-77-ci ayələr].

Zeyd ibn Arqam ﵁ Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Bığlarını qısaltmayan bizdən deyil”.[1]

İbn Ömər ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Məcusilərə müxalif olun, saqqallarınızı buraxıb, bığlarınızı qısaldın”.[2]

Həsən əl-Bəsri Ömərin ﵁ belə dediyini rəvayət etmişdir: “İstəyirəm bu şəhərlərə adamlar göndərim öyrənsinlər ki, kimlər həcc ziyarətinə getməyib. İmkanı olub həccə getməyənlərə cizyə (yəni, can vergisi) vacib edilsin,

---

[1] (Səhih) ət-Tirmizi /2762/, ən-Nəsai 1/15, Əhməd 4/366.

[2] (Səhih) əl-Buxari /5892-5893/, Muslim /259/.

çünki onlar müsəlman deyillər, çünki onlar müsəlman deyillər (iki dəfə)".[1]

Əbu Əyyub əl-Ənsarı ﷺ rəvayət edir ki, o, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Kim ana ilə övladı bir-birindən ayırarsa, Qiyamət günü Allah onunla sevdiyi insanları bir-birindən ayırar".[2]

Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur ki; "Varisinin miras payını verməkdən boyun qaçıranı Allah Cənnət mirasından məhrum edər".[3]

Həmçinin Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur ki; "İnsan ömrünün altmış ilini Allaha itaətlə keçirdikdən sonra, ölüm anında vəsiyyət edərək kiməsə zərər toxundurarsa, Cəhənnəmə girmək ona vacib olar".

Sonra Əbu Hureyrə ﷺ bu ayəni oxudu:

مِنۢ بَعۡدِ وَصِيَّةٖ يُوصَىٰ بِهَآ أَوۡ دَيۡنٍ غَيۡرَ مُضَآرّٖۚ وَصِيَّةٗ مِّنَ ٱللَّهِۗ

***"Bu bölgü, vərəsələrə zərər yetirməmək şərti ilə* vəsiyyətin yerinə yetirilməsindən və ya borcun ödənilməsindən sonra *aparılır. Bunlar* Allah tərəfindən bir tövsiyədir"** [ən-Nisa surəsi, 12-ci ayə][4].

Amr ibn Xaricə ﷺ rəvayət edir ki; bir dəfə mən Peyğəmbərin ﷺ dəvə üzərində xütbə verərkən belə dediyini eşitdim: "Allah hər bir haqq sahibinin haqqını

---

[1] (Zəif) ibn Kəsir "əl-Fəruq"un müsnədi.
[2] (Səhih) Əhməd 5/412-413, ət-Tirmizi /1283/, əl-Hakim 2/55.
[3] (Zəif) ibn Məcə /3703/.
[4] (Zəif) ət-Tirmizi /2118/, Əbu Davud /2867/, ibn Məcə /2704/.



vermişdir, ona görə də miras buraxan şəxs (malını başqasına) vəsiyyət edə bilməz".[1]

Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü Allah yanında ən pis mövqedə olanlar, yaxınlıq etdikdən sonra, bir-birilərinin sirlərini yayan qadın və kişilərdir".[2]

Əbu Hüreyrə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qadına arxadan yaxınlıq edən şəxs lənətlənmişdir". Başqa bir ləfzdə: "Allah qadına arxadan yaxınlıq edən şəxsə nəzər salmaz".[3]

Peyğəmbər ﷺ demişdir: "Kim heyzli qadınla və ya qadına arxadan yaxınlıq edərsə, eləcə də kahinin yanına gəlib onun dediyini təsdiqləyərsə, Allahın Muhəmmədə ﷺ nazil etdiyindən uzaqlaşar".[4]

Peyğəmbər ﷺ demişdir: "Əgər bir nəfər sənin iznin olmadan gizlicə sənə (və ya sənin övrətinə) baxdığı zaman, ona tərəf daş atsan, həmin daş da onun gözünü çıxarsa, sənə günah yazılmaz".[5]

O ﷺ həmçinin demişdir: "Kim icazəsiz olaraq başqasının evinə baxarsa, onların gəlib həmin şəxsin gözünü çıxarmaları halaldır".[6]

İbn Abbasdan رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: "Dində həddinizi aşmaqdan həzər edin. Şübhəsiz

---

[1] (Səhih) ət-Tirmizi /2121/, ən-Nəsai 6/247, ibn Məcə /2712/.
[2] (Səhih) Muslim /1437/.
[3] (Səhih) Əhməd 2/444, Əbu Davud /2162/.
[4] (Səhih) ət-Tirmizi /135/, Əbu Davud /3904/, ibn Məcə /639/.
[5] (Səhih) əl-Buxari /6902/, Muslim /2158/.
[6] (Səhih) Muslim /2158/.



ki, sizdən əvvəlkiləri həlak edən onların hədlərini aşmaları olmuşdu”.[1]

Uca Allah buyurur:

قُلْ يَٰٓأَهْلَ ٱلْكِتَٰبِ لَا تَغْلُوا۟ فِى دِينِكُمْ غَيْرَ ٱلْحَقِّ وَلَا تَتَّبِعُوٓا۟ أَهْوَآءَ قَوْمٍ قَدْ ضَلُّوا۟ مِن قَبْلُ وَأَضَلُّوا۟ كَثِيرًا وَضَلُّوا۟ عَن سَوَآءِ ٱلسَّبِيلِ

**“De: “Ey Kitab əhli! Dininizdə haqsız yerə ifrata varmayın. Öncə azmış, bir çoxlarını da azdırmış və doğru yoldan çıxmış bir dəstənin istəklərinə tabe olmayın”** [əl-Maidə surəsi, 77-ci ayə].

İbn Həzm ﷺ dində ifrata varıb həddi aşmağı böyük günahlardan saymışdır.

İbn Ömər رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Sizlərdən birinizin yanında (bir işdən ötrü) Allaha and içildiyi zaman ona inansın, buna inanmayan şəxs Allaha yaxın olanlardan olmaz”.[2]

Əbu Bəkr əs-Siddiq رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: “Hiyləgər, söz gəzdirən və paxıl Cənnətə girməz”.[3]

Peyğəmbər ﷺ demişdir: “İnsanın öz ailəsinin ehtiyacı olaraq, başqasına verməsiylə əldə etdiyi günah ona yetər”.[1]
yetər”.[1]

[1] (Səhih) ən-Nəsai 5/268, ibn Məcə /3029/, Əhməd 1/215.

[2] (Səhih) ibn Məcə /2101/.

[3] (Zəif) ət-Tirmizi /1964/, Əhməd ¼.



O ﷺ həmçinin demişdir: "İnsanın hər eşitdiyi şeyi danışmasının günahı onun (Cəhənnəmə girməsi) üçün kifayətdir".[2]

Uca Allah buyurur:

ٱلَّذِينَ يَبۡخَلُونَ وَيَأۡمُرُونَ ٱلنَّاسَ بِٱلۡبُخۡلِۗ وَمَن يَتَوَلَّ فَإِنَّ ٱللَّهَ هُوَ ٱلۡغَنِيُّ ٱلۡحَمِيدُ

**"O kəsləri ki, özləri xəsislik edir, insanlara da xəsislik etməyi əmr edirlər. Kim *haqdan* üz çevirsə, *bilsin ki,* Allah, həqiqətən də, Zəngindir, Tərifəlayiqdir"** [əl-Hədid surəsi, 24-cü ayə].

سَيُطَوَّقُونَ مَا بَخِلُواْ بِهِۦ يَوۡمَ ٱلۡقِيَٰمَةِۗ

**"Onların xəsislik etdikləri şey qiyamət günü boyunlarına dolanacaqdır"** [Ali İmran surəsi, 180-cı ayə].

هَٰٓأَنتُمۡ هَٰٓؤُلَآءِ تُدۡعَوۡنَ لِتُنفِقُواْ فِي سَبِيلِ ٱللَّهِ فَمِنكُم مَّن يَبۡخَلُۖ وَمَن يَبۡخَلۡ فَإِنَّمَا يَبۡخَلُ عَن نَّفۡسِهِۦۚ وَٱللَّهُ ٱلۡغَنِيُّ وَأَنتُمُ ٱلۡفُقَرَآءُۚ

**"Budur, siz Allah yolunda *malınızdan* xərcləməyə dəvət edilirsiniz. Aranızda isə simiclik edənlər də tapılır. Kim simiclik etsə, ancaq öz əleyhinə etmiş olar. Allah Zəngin, siz isə kasıbsınız"** [Muhəmməd surəsi, 38-ci ayə].

[1] (Səhih) Muslim /996/.
[2] (Səhih) Muslim /5/.

وَأَمَّا مَنۢ بَخِلَ وَٱسۡتَغۡنَىٰ ﴿٨﴾ وَكَذَّبَ بِٱلۡحُسۡنَىٰ ﴿٩﴾ فَسَنُيَسِّرُهُۥ لِلۡعُسۡرَىٰ ﴿١٠﴾ وَمَا يُغۡنِي عَنۡهُ مَالُهُۥٓ إِذَا تَرَدَّىٰٓ ﴿١١﴾

**“Kim də xəsislik edərək *Rəbbinə* ehtiyacı olmadığını güman edirsə və ən gözəl olan *“lə ilahə illəllah” kəlməsini* yalan hesab edirsə, Biz onun üstünə ən çətin olanı yükləyəcəyik. *Cəhənnəmə* düşdükdə var-dövləti ona fayda verməyəcək”** [əl-Leyl surəsi, 8-11-ci ayələr].

مَآ أَغۡنَىٰ عَنِّي مَالِيَهۡۜ

**“Var-dövlətim məni *əzabdan* qurtarmadı”** [əl-Həqqa surəsi, 28-ci ayə].

قَالُواْ مَآ أَغۡنَىٰ عَنكُمۡ جَمۡعُكُمۡ وَمَا كُنتُمۡ تَسۡتَكۡبِرُونَ

**“**(Əraf əhlinə) **Sizə nə yığdıqlarınız, nə də təkəbbürlük göstərməyiniz fayda vermədi”** [əl-Əraf surəsi, 48-ci ayə].

وَمَن يُوقَ شُحَّ نَفۡسِهِۦ فَأُوْلَٰٓئِكَ هُمُ ٱلۡمُفۡلِحُونَ

**“Nəfsinin tamahından qorunan kimsələr nicat tapanlardır”** [əl-Həşr surəsi, 9-cu ayə].



Peyğəmbər ﷺ demişdir: "Zülm etməkdən çəkinin, çünki (bu dünyada) edilən zülm Qiyamət günü zülmətlərə çevriləcəkdir. Həmçinin paxıllıqdan da çəkinin, çünki paxıllıq sizdən əvvəlkiləri həlak etmiş, onların bir-birinin qanını tökməyə və haramlarını halal etmələrinə səbəb olmuşdur". [1]

O ﷺ həmçinin demişdir: "Məgər paxıllıqdan daha pis xəstəlik nə ola bilər?" [2]

Başqa bir hədisdə isə deyilir: "Üç şey (sahibini) həlak edicidir: məhkum olunan paxıllıq, tabe olunan nəfsin istəkləri və hər kəsin öz rəyini bəyənməsi".[3]

Ət-Tirmizi rəvayət etmişdi ki, Peyğəmbər ﷺ məclisin ortasında oturan kəsi lənətləmişdir.[4]

Əbu Hureyrə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həsəd aparmaqdan çəkinin, çünki od odunu yandırıb yediyi kimi, həsəd də savabları yeyir".[5]

Peyğəmbər ﷺ demişdir: "Namaz qılanın önündən keçən şəxs nə qədər böyük günah qazandığının fərqində olsaydı qırx (gün, ay və ya il) dayanmağı onun üçün daha xeyirli olardı".[6]

Peyğəmbər ﷺ həmçinin demişdir: "Sizlərdən biriniz sütrəyə tərəf namaz qıldığı zaman kimsə gəlib onun önündən keçmək istərsə, onu dəf etsin, əgər yenə keçmək istəsə

---

[1] Əvvəlki mənbə.
[2] (Səhih) əl-Buxari /3137/.
[3] (Həsən) əl-Beyhəqi /745/, "Səhih hədislər silsiləsi" /1802/.
[4] (Zəif) ət-Tirmizi /2754/, Əbu Davud /4826/, Əhməd 5/384.
[5] (Zəif) Əbu Davud /4903/.
[6] (Səhih) əl-Buxari /510/, Muslim /507/.



onunla mübarizə aparsın, çünki o şeytandır". Muslimin rəvayət etdiyi ləfzdə isə: "Əgər yenə keçmək istəsə onunla mübarizə aparsın, çünki onun həmkarı var". (yəni şeytan onunla birgədir)[1]

Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Canım Əlində olan Allaha and olsun ki, iman gətirməyincə Cənnətə girməyəcəksiniz, bir-birinizi sevməyincə də iman gətirmiş olmazsınız. Sizə elə bir şey deyimmi ki, onu etməklə bir-birinizi sevəsiniz? Salamı öz aranızda yayın".[2]

---

[1] (Səhih) əl-Buxari /509/, Muslim /505/.
[2] (Səhih) Muslim /54/.



# KİTABIN SONU

*Həmd aləmlərin Rəbbi olan Allaha məxsusdur, Muhəmmədə onun ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun.*



# Mündəricat





